**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**Mart-Aprel**
**№ 2 (660)**
**2014**

**Elmi-nəzəri, pedaqoji jurnal**

## BU NÖMRƏDƏ

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 04

---

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**

# ƏLİ BƏY HÜSEYNZADƏNİN 150 İLLİK YUBİLEYİNİN KEÇİRİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

2014-cü ilin fevral ayında Azərbaycan ictimai fikrinin görkəmli nümayəndəsi, tanınmış maarifçi və yazıçı-publisist Əli bəy Hüseynzadənin anadan olmasının 150 illiyi tamam olur.

Türk xalqlarının mədəni inteqrasiyasının məfkurə kimi təşəkkül tapmasında mühüm rol oynayan, müasir cəmiyyət quruculuğunda demokratik prinsiplərin ənənəvi dəyərlər zəminində bərqərar olmasının vacibliyini irəli sürən və müstəqil milli dövlətçiliyin nəzəri əsaslarının işlənib hazırlanmasında yaxından iştirak edən, eləcə də çoxşaxəli fəaliyyəti boyunca yaratdığı zəngin fəlsəfi-publisistik, ədəbi-elmi irsi sayəsində Azərbaycan maarifçiliyi tarixinə qiymətli töhfələr verən görkəmli ictimai xadim Əli bəy Hüseynzadənin 150 illik yubileyinin keçirilməsini təmin etmək məqsədilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

**1.** Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Milli Elmlər Akademiyası ilə birlikdə, Azərbaycan Yazıçılar Birliyinin təklifləri nəzərə alınmaqla, Əli bəy Hüseynzadənin 150 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

**2.** Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 21 yanvar 2014-cü il*

# ƏLİ BƏY HÜSEYNZADƏ AZƏRBAYCAN MAARİFÇİLİYİNİN KORİFEYLƏRİNDƏN BİRİ KİMİ

**Əsgər Quliyev**
***Azərbaycan Respublikası Təhsil Nazirliyi***
***Dərslik və nəşriyyat şöbəsinin müdir müavini,***
***filologiya üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim***

*Bu il fevralın 24-də XX əsr Azərbaycan ictimai fikrinin görkəmli nümayəndəsi, türkçülük məfkurəsinin böyük carçısı, tanınmış ədib, publisist, maarifçi, rəssam və təbabət alimi Əli bəy Hüseynzadənin (1864-1940) anadan olmasının 150 illiyi tamam oldu. Böyük Azərbaycan ziyalısı Əli bəy Hüseynzadənin yubileyinin ölkə miqyasında dövlət səviyyəsində qeyd olunmasını təmin etmək məqsədilə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən "Əli bəy Hüseynzadənin 150 illik yubileyinin keçirilməsi haqqında" 21 yanvar 2014-cü il tarixli Sərəncam imzalanmış, bu tarixi yubileyin keçirilməsi ilə bağlı müvafiq dövlət qurumlarına tapşırıqlar verilmişdir. Sərəncamda deyildiyi kimi, türk xalqlarının mədəni inteqrasiyasının məfkurə kimi təşəkkül tapmasında mühüm rol oynayan, müasir cəmiyyət quruculuğunda demokratik prinsiplərin ənənəvi dəyərlər zəminində bərqərar olmasının vacibliyini irəli sürən və müstəqil dövlətçiliyin nəzəri əsaslarının işlənib hazırlanmasında yaxından iştirak edən Əli bəy Hüseynzadə çoxşaxəli fəaliyyəti boyunca yaratdığı zəngin fəlsəfi-publisistik, ədəbi-elmi irsi sayəsində Azərbaycan maarifçiliyi tarixinə də qiymətli töhfələr vermişdir.*

*Aydındır ki, klassik mədəni irsə, milli-mənəvi dəyərlərə dövlətin və dövlət başçısının daimi diqqət və qayğısının parlaq təzahürü olan bu tarixi Sərəncamın Əli bəy Hüseynzadənin Azərbaycanın məktəb və pedaqoji fikir tarixinin öyrənilməsində, xalqımızın milli oyanışı, özünüdərki və dirçəlişində, milli məfkurənin yaranmasında, milli maarifçilik hərəkatının inkişafında, mətbuat və mədəniyyətimizin tərəqqisi yolunda, milli dövlətçiliyimizin formalaşmasında təmənnasız xidmətlərinin müstəqil dövlətçilik təfəkkürü kontekstində yenidən dəyərləndirilməsində, onun zəngin irsinin dərindən tədqiqi və təbliğində müstəsna rolu vardır.*

***

Müasirləri böyük Azərbaycan mütəfəkkiri, milli ideologiya səviyyəsində türkçülüyün "Ana Yasası" kimi dəyərləndirilən "türkləşmək, islamlaşmaq, avropalaşmaq (müasirləşmək)" triadasının yaradıcısı və ilk carçısı, milli bayrağımızdakı rənglər simvolikasının müəllifi, türk dünyasında milli özünüdərkin və milli istiqlal düşüncəsinin mücahidi, XX əsr Azərbaycan ədəbiyyatında "Füyuzat" ədəbi məktəbinin banisi, ensiklopedik şəxsiyyət, böyük maarifçi-pedaqoq Əli bəy Hüseynzadənin (1864-1940) türklük, islamlıq, millət və Vətən qarşısındakı xidmətlərini yüksək qiymətləndirərək, onu "Qafqaz müsəlmanlarının atası", "Qafqazdakı türk balalarına türklüyünü bildirən, həsəb-nəsəbini (soykökünü) öyrədən", "rəsuli- həqq" ("haqq elçisi"), "irqin (türklərin) ən mükəmməl öndəri", "külli-müsəlman aləminin iftixarı", "türk xalqlarına kimliyini bildirən dahi", "bütün türk dünyasında peyğəmbər kimi üfüqlər açan", "ilk turançı", "dahi mütəfəkkir", "fövqəlbəşər", "quzey

günəşi”, “bütün türk dünyasının mücahidi”, “türkçülüyün babası (atası)”, “milliyyətçi və mütəfəkkir”, “imanlı türkçü”, “yazı ustadı” və s. bu kimi yüksək epitetlərlə öyür, təqdir edirdilər. Sözsüz, bütün bunlar səbəbsiz deyildi. Çünki bu böyük İNSAN, dahi fikir və söz adamı 76 illik şərəfli ziyalı ömrünün yarım əsrdən çoxunu yorulmadan, usanmadan bütövlükdə türklüyün inkişafına, o cümlədən Azərbaycan xalqının milli oyanış və özünüdərkinə, maarif və mədəniyyətinin yüksəlişinə, milli istiqlal mücadiləsinə, milli dövlətçiliyin formalaşdırılmasına həsr etmişdi...

XIX əsrin sonu - XX əsrin əvvəllərində Azərbaycan xalqının milli oyanışında, əsası Mirzə Fətəli Axundzadə və Həsən bəy Zərdabi tərəfindən qoyulan milli maarifçilik hərəkatının, islamçılıq və qərbçilik (avropaçılıq) ideyalarının davam və inkişaf etdirilməsində müstəsna rol oynamış, millətimizin islam ümmətçiliyindən islam milliyyətçiliyinə və oradan türk milliyyətçiliyinə keçidinin əsas ideya və əməl rəhbərlərindən (Əlimərdan bəy Topçubaşov və Əhməd bəy Ağayevlə birgə) biri olan Əli bəy Hüseynzadə özünün irəli sürüb əsaslandırdığı “türkləşmək, islamlaşmaq, avropalaşmaq” milli dirçəliş və milli istiqlal formulu (düsturu) ilə türkçülüyün siyasi məramnaməsini və elmi-nəzəri əsaslarını, müasirlərinin dediyi kimi, milli istiqlal mücadiləsinin “Ana Yasası”nı verməklə milli tariximizə “türkçülüyün atası” kimi öz əbədi imzasını atmış oldu. Az sonra Azərbaycan Xalq Cümhuriyyətinin milli dövlətçilik ideologiyasına çevrilən bu triada (“üçlü məram”) milli bayrağımızdakı rənglər palitrası vasitəsilə əbədiləşdi və sonsuzluğa qədər Azərbaycan xalqının qan yaddaşına daxil oldu. Bu mənada bu gün də başlarımız üzərində əzəmətlə dalğalanan milli bayrağımızdakı üç rəngin bildirdiyi simvolik məna Əli bəy Hüseynzadənin müəllifi olduğu “türkləşmək, islamlaşmaq, müasirləşmək” formulunun rənglərlə ifadəsindən ibarətdir. Əli bəy Hüseynzadə belə hesab edirdi ki, azərbaycanlıların millət məfkurəsi türkləşmək, dini məfkurəsi islamlaşmaqdırsa, iqtisadi, mədəni, sosial-siyasi məfkurəsi avropalaşmaq (müasirləşmək) olmalıdır. Türkiyədə türkçülüyün böyük ideoloqu kimi tanınan Ziya Göyalp Əli bəyi özünün ustadı sayaraq sonralar həmin üçlü qayənin sosioloji baxımdan “millətini tanı, ümmətini tanı, mədəniyyətini tanı!” anlamını verən “türk millətindənəm, islam ümmətindənəm, Batı (qərb, Avropa) mədəniyyətindənəm ” şəklində formula etmişdir...

Əli bəy Hüseynzadə milli mədəniyyət və ictimai-siyasi fikir tariximizdə təkcə dahi mütəfəkkir şəxsiyyət kimi deyil, eyni zamanda böyük maarifçi - pedaqoq - ziyalı, məşhur həkim-tibb professoru, rəssam, musiqişünas kimi də tanınmaqdadır. Bu mənada Əli bəyin müasiri olmuş, görkəmli tarixçi Yusif Akçuraoğlu haqlı olaraq yazırdı ki, əfsanəvi Əli bəy dünyanın bütün dillərini, elm və fənlərin hər növünü, ədəbiyyat və incəsənətin hər şöbəsini tamamən əhatə etmiş və tətbiqə müvəffəq olmuş fövqəlbəşər idi ...

Azərbaycanın milli təhsil və pedaqoji fikir tarixinə də dəyərli töhfələr vermiş bu böyük mütəfəkkirin maarifçilik görüşlərində millətin tərəqqi və oyanışında, mədəni yüksəlişində maarifin, təhsilin, elm və mədəniyyətin müstəsna roluna, milli istiqlala aparan yolun məhz xalqın maariflənməsindən keçməsinə və bu yolda ana dilində tədrisin təməl prinsip olmasına, ümumbəşəri dəyərlərdən milli təkamül və inkişafda istifadənin əsas şərtlərinə dair müdrik fikirlərindən bir neçəsini xatırlatmaq yerinə düşərdi.

• “Türk xalqları birinci dövrdə qılıncla (Hun imperatorluğu dövrü nəzərdə tutulur – Ə.Q.), ikinci dövrdə dinlə (Osmanlı imperatorluğu dövrü - Ə.Q.) parlamışdırsa, indi isə, yəni üçüncü dövrdə (XX əsrdə) elm və biliklə parlamalıdırlar...”, “Bizə qılınc deyil,

əhli-maarif lazımdır...”;

• “Maarif, ittihad (milli birlik ), hürriyyət (azadlıq) ! Nə qədər gözəl nemətlər! Bunları unutmayalım! Çünki əsl nicat bu üç qüvvətdədir... ”;

• “Bizim özümüzə məxsus daha layiq, daha şanlı bir vəzifeyi-mücahidəmiz vardır ki, o vəzifə də zülməti-qəflətdə bulunan külliyyəti-avam arasında nuri-maarifi əkməkdir...”;

• “Bilgi... və elm lisan (dil) ilə olur. Bir əcnəbi lisanında dəxi elm təhsil oluna bilər. Fəqət bu surətlə təhsil olunan elm məhdud fərdlərin beynində qalır. Millətin əksəriyyəti arasında yayılmır. Elm və maarif əksəriyyət beynində inkişaf etmək üçün lazımdır ki, millətin öz ana dili maarif təhsilinə alət (vasitə) olsun...”;

• “Avropa elminə, maarifinə, ədəbiyyatına, sənət və sənayesinə bələd olmağa (öyrənməyə) və millətimiz beynində yaymağa çalışmalıyız... ”;

• “Biz avropalıların ədəbiyyatlarına, sənayelərinə, elm və maariflərinə, kəşfiyyat və ixtiralarına müraciət etmək istəyirik, özlərinə deyil! Biz istəyirik ki, islam ölkəsinə onların beyinləri girsin, boğazları, mədələri girməsin. Biz istərik ki, ölkəmiz onların beyinlərini həzm etsin, yoxsa mədələrində həzm olunmasın ... ” və s.

**Hörmətli oxucu!** Diqqətlə fikir verdinizsə, Əli bəyin 100 il bundan qabaq böyük uzaqgörənliklə söylədiyi bu müdrik kəlamlardakı işıqlı, nurlu ideyalar nəinki köhnəlməyib, əksinə bu günümüzlə də həmahəng səslənir. Böyük maarifçi XX əsrin böyük kəşflər, yeni texnologiyalar əsri olacağını irəlicədən görür və türk xalqlarını, o cümlədən Azərbaycan xalqını şanlı keçmişi ilə öyünməyi bir tərəfə atıb, elm, maarif və mədəniyyət əsrində dünya xalqları içərisində özünəlayiq yer tutmağa səsləyirdi.

Diqqət edin, BMT XXI əsri ötən əsrin sonlarında “Təhsil əsri” – “İntellekt əsri” elan edib. Əli bəy bir əsr bundan qabaq XX əsri “elm və bilik əsri” (əslində “təhsil”) hesab edir, millətimizin elmlə, maariflə, təhsillə inkişaf edəcəyinə (parlayacağına) inanırdı. O inanırdı ki, milli istiqlala gedən yol öz başlanğıcını maarifdən, elmdən, təhsildən götürür...

Xalqın maariflənməsinin təməl yolunun ana dilinin əsas tədris dilinə-təhsil, təlim vasitəsinə çevrilməsi haqda Əli bəyin müdrik fikri bu gün də aktual səslənir. Azərbaycanda bu böyük maarifçinin nurlu ideyasının təməli ilk dəfə Xalq Cümhuriyyəti (1918-1920-ci illər) illərində qoyuldu. Nə xoşbəxtik ki, bu gün müstəqil Azərbaycanda milli təhsilimizin əsas təlim - tədris dili dövlət dili olan Azərbaycan dilindədir...

Nəhayət, Əli bəyin millətin tərəqqisi naminə Avropa elm, təhsil və mədəniyyətinin əsas nailiyyətlərinin, ümumbəşəri dəyərlərinin öyrənilməsi, bu zaman xalqımızın “onların beyinlərini həzm etməsi, fəqət mədələrində həzm olunmaması” barədə peyğəmbərcəsinə söylədiyi işıqlı ideyalar bu gün Avropa təhsil məkanına inteqrasiya yolunu tutmuş Azərbaycan təhsilinin prioritet istiqamətlərindən biridir...

Əli bəy Hüseynzadə fenomenal fikir adamı, tarixdə böyük izlər qoymuş nurlu şəxsiyyət, böyük ziyalı idi. Lakin, təəssüf ki, Azərbaycanın ictimai-siyasi və mədəni fikir tarixinin, bütövlükdə türk dünyasının bu böyük şəxsiyyəti sağlığında müasirləri tərəfindən yüksək qiymətləndirilsə də, Azərbaycanda 28 Aprel çevrilişi nəticəsində meydana çıxan sovet rejimində kommunist ideologiyası digər milli-mənəvi dəyərlər kimi, Əli bəy Hüseynzadə fenomenini də unutdurmaq, onun böyük əməllərini xalqın yaddaşından silmək, tarixi xidmətlərini saxtalaşdırmaq yolunu tutdu. Bu böyük insan haqqında böhtan və iftiralara geniş meydan verildi, adına cürbəcür “yarlıqlar” (“burjua millətçisi”, “pantürkist” və s.) yapışdırıldı,

qohumları "qırmızı terrora" məruz qaldı, əsərlərinin nəşrinə qadağalar qoyuldu...

Görkəmli ədəbiyyatşünas alim, mərhum Yaşar Qarayevin sözləri ilə desək, Azərbaycan sovet ədəbiyyatşünaslığında (1920-1991-ci illər) və siyasi-ictimai fikrində Əli bəy Hüseynzadəyə və "Füyuzat" ədəbi məktəbinə qarşı yağdırılmış iftira və böhtan fəvvarəsi ilə müqayisədə hətta üzdəniraq "erməni mənbələri" və "əlyazmaları" da "toya getməli" görünürdü... (Bax: Ə.Hüseynzadə seçilmiş əsərləri. Bakı, 2007, "ön söz").

Lakin sovet rejiminin bütün basqı və qadağalarına baxmayaraq, Əli bəy Hüseynzadənin böyük adı və əməllərini xalqın yaddaşından silmək, tarixin səhifələrindən çıxarmaq mümkün olmadı. XX əsrin sonunda Azərbaycanın ikinci dəfə dövlət müstəqilliyinə qovuşması Əli bəy Hüseynzadə fenomenini yenidən millətimizə, mədəniyyətimizə, ədəbiyyatımıza, bütövlükdə ictimai-siyasi fikir tariximizə qaytardı. Bu, əslində Əli bəy Hüseynzadənin doğulduğu, lakin çox az müddət yaşadığı doğma Vətəninə bir növ mənəvi qayıdışı idi ki, bu missiyanın önündə ömrünü bu böyük mütəfəkkirin əsərlərinin toplanmasına, tədqiqinə, nəşrinə və təbliğinə həsr etmiş görkəmli mətnşünas alim mərhum Ofelya xanım Bayramlı gəlir. Onun tərtibçiliyi ilə Əli bəy Hüseynzadənin kamil 2 cildlik seçilmiş əsərləri, "Füyuzat" jurnalının tam komplekti latın əlifbasında nəşr edildi. "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında" 12 yanvar 2004-cü il tarixli Prezident Sərəncamına uyğun olaraq onun bircildlik seçilmiş əsərləri kütləvi tirajla çap olunaraq ölkənin bütün kitabxanalarına hədiyyə edildi. Əli bəy Hüseynzadənin son illərdə ictimai-siyasi, ədəbi fəaliyyətinə dair xeyli araşdırmalar aparılmış, haqqında Rəfiq Zəka, Azər Turan, Şamil Vəliyevin (Körpülünün) dəyərli monoqrafiyaları nəşr edilmiş, çoxsaylı elmi, elmi-kütləvi məqalələr çap olunmuşdur.

Etiraf etməliyik ki, bu dahi söz və fikir adamının çoxcəhətli fəaliyyəti xalqa hələlik gərəyincə və yetərincə çatdırılmayıb. Onun zəngin bioqrafiyasında öyrənilməli və faydalanmalı məqamlar kifayət qədər çoxdur...

**Əziz oxucu!** Böyük ömrün tarixi məqamlarını gəlin birlikdə vərəqləyək...

Əli bəy Hüseyn bəy oğlu Hüseynzadə 24 fevral 1864-cü ildə Azərbaycanın qədim şəhərlərindən olan Salyanda ruhani müəllim ailəsində doğulub. Balaca Əli bəy ibtidai təhsilini atası Molla Hüseynin də müəllim işlədiyi Tiflis Müsəlman Məktəbində alıb. Çox erkən yaşlarında valideynlərini itirən Əli bəy ana babası-böyük maarifpərvər, müasirləri tərəfindən "Qafqazın birinci adamı" adlandırılan Qafqaz Şeyxülislamı Axund Əhməd Səlyaninin (1812-1884) himayəsində qalıb. Altısinifli müsəlman məktəbini uğurla başa vuran Əli bəy babası Axund Əhmədin tövsiyəsi və "Rusiyada iki böyük türkçüdən biri" (Ziya Göyalp) sayılan Mirzə Fətəli Axundzadənin (1812-1978) köməkliyi ilə 1875-1885-ci illərdə Tiflis şəhər 1-ci kişi gimnaziyasında mükəmməl tam orta təhsil alıb. 1885-ci ildə Sankt-Peterburq Universitetinin fizika-riyaziyyat fakültəsinə daxil olmuş, oranı 1889-cu ildə fərqlənmə diplomu ilə bitirmişdi. Tələbəlik illərində o, həm də Sankt-Peterburq Rəssamlıq Akademiyasının məşğələlərində azad dinləyici kimi iştirak etmiş, rəssamlıq sahəsində istedad və bacarığını təkmilləşdirməyi də unutmamışdı...

Sankt-Peterburqda universitet təhsili alan Əli bəy bununla kifayətlənməmiş, Türkiyəyə gedərək İstanbul Universitetinin əsgəri-tibb fakültəsində (1890-95) ali tibb təhsili də almışdı.

Əvvəllər bir müddət həkim-dermatoloq, sonralar isə İstanbul Universitetində professor köməkçisi işləyən Əli bəy Hüs-

eynzadə siyasi fəaliyyətə qoşulur. Buna görə də Sultan II Əbdülhəmidin onun haqqındakı həbs qərarı ilə bağlı təqiblərdən qorunmaq məqsədilə 1903-cü ildə köhnə tanışı olan bir hindli tacirin gəmisində gizli şəkildə Hindistana, oradan Çinə, nəhayət, Bakıya gəlib çıxır...

Əli bəy Hüseynzadənin həyatında Bakı dövrü (1903-1910-cu illər) yeni mərhələnin başlanğıcı olur. Rusiyadan kənarda təhsil aldığı üçün Bakıda həkimlik işinə qəbul edilməyən Əli bəy publisistik fəaliyyətlə məşğul olmağa başlayır. Bu illərdə Bakıda yaşayıb-yaradan Əlimərdan bəy Topçubaşov, Əhməd bəy Ağayev kimi tanınmış ziyalılarla sıx təmaslar qurur, böyük mesenat, maarifçi-xeyriyyəçi Hacı Zeynalabdin Tağıyevin maliyyə dəstəyi ilə millətin oyanışında, insan hüquqlarının qorunmasında, xalqın maariflənməsində əvəzsiz vasitə olan mətbuat vasitəsilə milli mücadiləyə başlayır. Çünki o dövrün ziyalıları hesab edirdilər ki, "mətbuat bir millətin lisanı (dili), samiəsi (qulağı), nəzəri (gözü), beyni deməkdir. Mətbuatsız millət söyləyəməz, eşidəməz, görəməz"... ("Füyuzat" 1907, № 29)...

Bu illərdə Rusiyada baş verən siyasi proseslər çar hökumətini müəyyən islahatlar aparmaq məcburiyyətində qoyur. Bu tarixi şəraitdən yararlanmaq istəyən Azərbaycan ziyalıları 1905-ci il martın 15-də Hacı Zeynalabdin Tağıyevin mülkündə yığıncaq keçirərək yerli azərbaycanlılara da mədəni, sosial-iqtisadi, siyasi hüquq və azadlıqların, o cümlədən ana dilində ümumi təhsilin verilməsinə, mətbuat və kitabların nəşr edilməsinə dair Rusiya hökumətinə təqdim etmək üçün ərizə (petisiya) hazırlayırlar. Bu sənədin hazırlanmasında Əlimərdan bəy Topçubaşov (Topçubaşi), Əhməd bəy Ağayev (Ağaoğlu), Əsədulla bəy Muradxanov, Fərrux bəy Vəzirov, Adilxan Ziyadxanov, Mirzə Əsədullayev, Mustafa ağa Vəkilov və başqaları ilə yanaşı, Əli bəy Hüseynzadə də fəal iştirak edir. Azərbaycan türklərinin bu istək və tələblərini Qafqaza yeni canişin təyin olunmuş Vorontsov-Daşkova çatdırmaq üçün Hacının maliyyə yardımı ilə Əli bəy Hüseynzadə, Əlimərdan bəy Topçubaşov və Əhməd bəy Ağayevdən ibarət nümayəndə heyəti Sankt-Peterburqa göndərilir. Həmin il aprelin 21-də canişinlə görüşən Azərbaycan ziyalıları digər tələblərlə yanaşı, ana dilində "Həyat" qəzetinin nəşrinə icazə istədiklərini ona çatdırırlar. Çox çətinliklə qəzetin nəşrinə razılıq verilir...

"Həyat" qəzetinin sahibi-imtiyazı mərhəmətli Hacı Zeynalabdin Tağıyev, naşiri Əlimərdan bəy Topçubaşov, redaktorları Əli bəy Hüseynzadə və Əhməd bəy Ağayev idi. Azərbaycanın bu üç böyük fikir nəhəngi və söz adamının rəhbərliyi ilə nəşrə başlayan "Həyat" o dövrdə Azərbaycanda nəşr olunan yeganə anadilli qəzet idi. Azərbaycan xalqının milli dirçəlişində, türkçülük ideyalarının yayılmasında müstəsna rol oynamış bu qəzet qısa ömürlü (07.06.1905-04.09.1906) olsa da, milli mətbuat, eləcə də ictimai-siyasi fikir tarixində dərin izlər qoymuşdu. Bu işdə Əli bəyin xüsusi xidmətləri olmuşdu. Qəzet ilk nömrəsindən bağlanana kimi türkçülüyün, islamçılığın və qərbçiliyin (müasirliyin) siyasi tribunasına çevrilmişdi ki, bunun da mərkəzində Əli bəyin işıqlı ideyaları dururdu...

XIX əsrin ikinci yarısında rus çarizmi digər milli-mənəvi dəyərlər kimi xalqımızın adına da "təcavüz" etmiş, onun əsl "türk" adını qadağan etməyə, uydurma "tatar", "müsəlman" adları ilə soykökünü unutdurmağa qismən "nail olmuşdu". İş o həddə çatmışdı ki, xalqımızın nümayəndələrindən milliyyətini soruşduqda "müsəlmanam", - deyə cavab verir, öz soykökünü deməkdən belə çəkinirdi. Bu acı həqiqəti görən görkəmli ədib Ömər Faiq Nemanzadə "Mən kiməm?" adlı yazısında ürək ağrısı ilə ya-

zırdı: *"Hə ey türk! İstər darıx, istər karıx, yaxandan əl çəkəcək deyiləm. Sən hər şeyi öyrənmək istədiyin halda bircə zadı-yəni özünü bilmək istəmirsən, niyə öz soy və nəslindən xəbərin yox? Niyə sənə "Kimsən?" dedikləri vaxt həqiqi cavabında aciz qalırsan? Niyə sadəcə deyə bilmirsən ki, mən türkəm. Niyə deyə bilmirsən ki, şiəlikdən, sünnilikdən, babılıqdan əvvəl sən türk idin. İndi də türksən və bundan sonra da türk qalacaqsan..."*

Bəli, belə bir tarixi şəraitdə, yəni "türk" kəlməsinin hətta dilə belə gətirilmədiyi, "Mən türkəm" söyləməyə imkan verilmədiyi bir tarixi məqamda Əli bəy Hüseynzadə "Həyat" qəzetinin səhifələrində çap etdirdiyi "Türklər kimdir və kimlərdən ibarətdir?" adlı əsəri ilə türk xalqlarına, o cümlədən Azərbaycan türklərinə üz tutaraq "Biz tatar deyilik, biz türkük", - deyə hayqırdı, xalqa öz adıyla "türk" dedi və bunu başqalarına da dedirtdi, türklərin kimliyini onlara anlatdı. Bu mənada Azərbaycanda türkçülük hərəkatının həqiqi tarixi Əli bəyin redaktoru olduğu "Həyat" qəzeti ilə başlayır. Təsadüfi deyil ki, görkəmli çağdaş Amerika tarixçisi Tadeuş Svyatoxovski doğru olaraq, "XX əsrin əvvəllərində türk xalqlarına kimliyini bildirən bir nəfər var idi. O da Əli bəy Hüseynzadə idi ", - deyirdi ...

Lakin Əli bəyin qəzetdəki türkçülük, islamçılıq və qərbçilik ideyaları türkün əbədi düşmənləri, xüsusən də rusların əlində türklərə qarşı hər zaman bir alət rolunu oynayan erməniləri ciddi narahat edirdi. Erməni xəfiyyələrinin "Həyat" qəzeti barədə donoslarının birinin üstündə Qafqaz canişininin dərkənarında təcili olaraq "Həyat"ın sərlövhəsindəki "türk" sözünün silinməsi, əvəzinə "tatar" sözünün yazılması əmr edilirdi. Lakin Əli bəy nəinki "türk" sözünü "tatar"la əvəzlədi, əksinə, "bu məsələ qayət mühümdür", - deyərək "Biz ki, türk oğlu türkük, biz ki, millətlərin ən qədimi və ulusuyuq", - deyə türklüyü təqdir etməkdə davam etdi. Buna görə də türkün düşmənlərinin təzyiqi ilə "Həyat" qapandı...

Çox keçmədi ki, böyük maarifçi, xeyriyyəçi Hacı Zeynalabdin Tağıyevin maliyyə yardımı və Əli bəy Hüseynzadənin redaktorluğu ilə "Füyuzat" dərgisi (1906-1907) nəşrə başladı. Əli bəy "Həyat"da başladığı türkçülük ideyalarını "Füyuzat"da da davam etdirərək, türkçülüyün siyasi proqramı olan "türkləşmək, islamlaşmaq, avropalaşmaq" formulunu bitkin bir sistem halına gətirdi: "Füyuzat"ın tutduğu yol türklük, müsəlmanlıq və avropalılıqdır" ("Füyuzat", 1907, № 23), - deyə öz ideyasına sadiqliyini bir daha təsdiqlədi... Yeri gəlmişkən, deyək ki, müəllifi Əli bəy Hüseynzadə olan bu üçlü məramın müasir tarixşünaslıqda ilk dəfə düzgün, ətraflı elmi şərhinin bu sətirlərin müəllifinin "Azərbaycan Respublikasının dövlət rəmzləri" kitabında (Bakı, 2001, s. 38-89) verildiyi elmi ədəbiyyatda da etiraf olunmuşdur (Bax: "Füyuzat". Bakı, 2006, "Ön söz", s. XIII; "Respublika" qəz. 12, 15 may 2002 –ci il ).

Əli bəy Hüseynzadənin bu dərgisi Azərbaycan ədəbiyyatında yeni bir istiqamətin-"Füyuzat" ədəbi məktəbinin (Hüseyn Cavid, Məhəmməd Hadi, Abbas Səhhət, Abdulla Şaiq və başqalarının təmsil olunduğu romantik ədəbiyyat) yaranmasına gətirib çıxardı. Lakin onun da ömrü qısa oldu və qəfildən bağlandı...

Bu qapanmanın maraqlı tarixçəsi vardır. O dövrün mətbuat səhifələrindən öyrənirik ki, Türkiyə Sultanı II Əbdülhəmidin taxta çıxmasının 32-ci ildönümü münasibəti ilə məcmuənin sahibi-imtiyazı Hacı Zeynalabdin Tağıyev görkəmli din xadimi Məhəmməd Kərim Ağanın Azərbaycan türkcəsinə tərcümə etdiyi "Qurani –Kərim"i altun cild, qiymətli daş və almazlarla bəzədərək görkəmli maarifçi və din xadimi Axund Yusif Talıbzadənin (1877–1922)

vasitəsilə Sultan II Əbdülhəmidə hədiyyə göndərir. Hədiyyəni qəbul edən Sultan Axund Yusifə müraciətlə: “Bir şeyi anlamıram. Hacı Zeynalabdin bəy dərgisində məni həcv edir, sonra da mənə hədiyyə göndərir”, - deyə narazılığını bildirir. Axund Yusif Bakıya dönən kimi Sultanın iradını Hacıya çatdırır. O da dərhal məcmuənin bağlanmasına qərar verir. Müasirləri tərəfindən “Azərbaycan türklərinin milli haqlarının aynası” (A.Şaiq) hesab edilən “Füyuzat” dərgisi 1907-ci il noyabrın 1-də beləcə qapanır... Onu da deyək ki, bu illərdə Əli bəy Hüseynzadə Rusiya I Dövlət Dumasının buraxılmasına etiraz əlaməti olaraq “Vıborq bəyannaməsi”ni imzaladığına görə həbs olunan Əlimərdan bəy Topçubaşovun əvəzinə, müvəqqəti olaraq rusca “Kaspi” qəzetinə də baş mühərrirlik (redaktorluq) (1907) etmişdi...

Əli bəy Hüseynzadə publisistik fəaliyyətlə yanaşı, ziyalı-müəllim ailəsində doğulan, xarizmatik bir ziyalı kimi pedaqoji sahəyə də xüsusi diqqət ayırmağı unutmamışdı. 1907-ci ilin avqustun 25-dən sentyabrın 4-dək Bakıda keçirilmiş Azərbaycan müəllimlərinin II qurultayının təşkili və keçirilməsində müstəsna rol oynamışdı. Qurultayda “Füyuzat” məcmuəsi və “Kaspi” qəzetinin müdiri kimi Əli bəy Hüseynzadə sədr, görkəmli pedaqoq Mahmud bəy Mahmudbəyov və müəllim Süleyman bəy (Sani) Axundov sədr müavinləri, müəllimlər: Üzeyir bəy Hacıbəyov, Mirzə Abdulla Talıbzadə (A.Şaiq) və Fərhad bəy Ağazadə katib seçilmişdilər. Qurultayda Azərbaycanda məktəb təhsilinin vacib məsələləri müzakirə edilmiş, dəyərli qərarlar qəbul edilmişdi. Qurultayın gedişi haqqında “Füyuzat” jurnalında (27-31-ci nömrələrdə) ətraflı stenoqrafik məlumat verilmişdi ki, bu məlumatlar bu gün həmin qurultay haqqında ən etibarlı və dəyərli mənbə sayılır.

“Füyuzat” məcmuəsi bağlandıqdan sonra Əli bəy fəaliyyətini pedaqoji sahədə davam etdirmiş, 1908-1910-cu illərdə “Səadət” Ruhani Xeyriyyə Cəmiyyətinin Bakıda təsis etdiyi (1908) “Səadət” məktəbində əvvəlcə türk dili və ədəbiyyatı müəllimi, məktəbin müdiri, əslən iranlı olan Mirzə Ələkbər Xan Bəhmən diplomatik fəaliyyətə keçdikdən sonra, həmin məktəbin müdiri olmuşdu. Əli bəy Hüseynzadənin müdir olduğu dövrdə müəllimlər işə müsabiqə yolu ilə seçilib qəbul edilirdi. Belə müəllimlərdən biri də məşhur Üzeyir bəy Hacıbəyli idi. Böyük Üzeyir bəy o zaman həmin məktəbə rus dili və hesab müəllimi kimi qəbul edilmişdi. Təkcə bu fakt Əli bəy Hüseynzadənin parlaq pedaqoji fəaliyyətinin bir örnəyi kimi onun maarifə, məktəbə, müəllimə hansı yüksək meyarlarla yanaşdığını aydın şəkildə göstərməkdədir...

Əli bəyin Üzeyir bəylə əməkdaşlığı təkcə məktəb həyatı, mətbuatla yekunlaşmamışdı. Belə ki, türk - islam dünyasında ilk opera sayılan Üzeyir bəy Hacıbəylinin “Leyli və Məcnun” operasının Hacı Zeynalabdin Tağıyevin teatrında baş tutan ilk tamaşasının (1908) bədii tərtibatçısı-rəssamı Əli bəy Hüseynzadə olduğu barədə tarixi faktlar da mövcuddur...

Əli bəy Hüseynzadə “Səadət” məktəbində çalışdığı illərdə ümumi təhsilin məzmunu, dərsliklərin dili və tərtibi prinsipləri, ədəbi dil və əlifba məsələlərinə dair qiymətli məqalələrlə mətbuatda çıxış etmiş, bu problemlərə dair onun mülahizələri uzun müddət mətbuatın gündəmindən düşməmiş, geniş müzakirə və diskussiyalara yol açmışdı... Ən maraqlısı bu idi ki, Əli bəy türk xalqları üçün ümumi ədəbi dil yaradılmasının tərəfdarı idi. Bu ideya o zaman qəbul edilməsə də, bu gün yenə də aktuallığını itirməyib. Bu böyük maarifçinin ədəbi dil konsepsiyasında əlifba məsələsi də xüsusi yer tuturdu. O, ərəb əlifbasının dəyişdirilməsinin qəti əleyhdarı idi, hətta M.F.Axundovu bu məsələyə görə kəskin tənqid edirdi. Ərəb əlifbasının

dəyişdirilməsi ideyasının türk xalqlarının mədəni inkişafına zərbə olacağı qənaətində idi. Bu ideyanın ortaya atılmasında rus "barmağı" olduğu inancında idi. XX əsrdə Azərbaycanda aparılan əlifba "islahatları" bu böyük maarifçinin nə qədər haqlı olduğunu təsdiqlədi...

Türkiyədə Sultan II Əbdülhəmidin taxtdan salınmasından artıq 2 il keçmişdi. Keçmiş inqilabçı dostları olan gənc türklərin dəvətilə Əli bəy 1910-cu ilin sonunda yenidən Türkiyəyə köçmək qərarına gəlir. Çox maraqlıdır ki, bu dahi fikir adamının Bakıdan getməsi qərarı dövrün tanınmış ziyalıları tərəfindən milli faciə kimi qarşılanmışdı. Müasirlərindən olan Əlabbas Müznib görkəmli fikir və söz adamı Əli bəyi "bir bölük maarif yetimi olan Qafqaz müsəlmanlarının atası" adlandırır, onu "dilsizlərin dili, karların qulağı, korların görən gözü" hesab edir, onun gedişiylə "Qafqaz əhalisinin başsız, böyüksüz" qalacağını ürək ağrısı ilə dilə gətirirdi...

Məhz bu münasibətlə yerli ziyalılar "Səadət" məktəbində Əli bəyin gedişi şərəfinə böyük ziyafət məclisi də təşkil etmişdilər. Böyük maarifçi Bakıdan ayrılarkən bütün ev əşyalarını və kitablarını üç il işlədiyi "Səadət" məktəbinə bağışlamağı da unutmamışdı... Sözsüz, bu addım onun böyük ziyalı təbiətindən irəli gəlmişdi...

Burada mədəniyyət tariximiz üçün çox maraqlı bir məqama da toxunmaq yerinə düşərdi. Belə ki, Əli bəy İstanbula köç ərəfəsində özünün yağlı boya ilə 1905-1906-cı illərdə çəkdiyi "Bibiheybət məscidinin görünüşü" adlı məşhur rəsm əsərini satış salonuna qoydurmuşdu. Salona gələn Bakıdakı ingilis konsulu Mak Donnelin həmin əsərdən xoşu gəlmiş və rəsmi almaq üçün sifariş vermişdi... "Orucov qardaşları" mətbəəsinin sahiblərindən biri bu xəbəri böyük mesenat Hacı Zeynalabdin Tağıyevə çatdırmışdı. Hacı demişdi:

- Görünür, Əli bəyin əli aşağıdır. Ona görə bu məşhur rəsm əsərini satmaq qərarına gəlib...

Hacı 500 manat verib deyir ki, həmin tablonu göndər bizə. Ancaq bu haqda Əli bəy heç nə bilməsin, məndən pul götürməz. Bibiheybət məscidinin şəkli qoy Bakıda qalsın, gedib Londona düşməsin...

Belə də edirlər. Bu böyük mesenatın milli qeyrəti və təəssübkeşliyi sayəsində Azərbaycan xalqının milli sərvəti olan bu gözəl sənət əsəri Əli bəyin öz vətənində qalır. Həmin əsər hazırda Azərbaycan Dövlət İncəsənət Muzeyində saxlanılır... (Bax: M.Süleymanov. Eşitdiklərim ..., səh. 121)

Yeri gəlmişkən deyək ki, Dövlət İncəsənət Muzeyində qorunan Əli bəyin Sankt-Peterburqda təhsil alarkən Tiflisdə çəkdiyi "Şeyxülislamın portreti" əsəri (1888) də 1903-cü ildə Əli bəy tərəfindən Vətənimizə gətirilib və qardaşı İsmayıl bəyə bağışlanıb. Muzeyə isə Bəhmən Hüseynzadə və həyat yoldaşı görkəmli tarixçi, mərhum professor Sara xanım Aşurbəyli tərəfindən bağışlanıb. Portret öz ana babası Şeyxülislam Axund Əhməd Səlyaniyə həsr edilib...

Nəhayət, Əli bəy Hüseynzadə Bakını 1910-cu il dekabrın 4-də tərk edərək Bakı - Tiflis-İstanbul marşrutu ilə 1911-ci il yanvarın 5-də İstanbula çatıb. Səfər zamanı Tiflisdə dəmiryol vağzalında böyük ədib Cəlil Məmmədquluzadə ilə təsadüfən görüşüb, aralarında çox səmimi söhbət olub...

İstanbulda yenidən həkimlik sənətini davam etdirən Əli bəy Hüseynzadə İstanbul Universitetinin tibb fakültəsində dəri-zöhrəbi xəstəlikləri üzrə professor köməkçisi, sonralar professoru seçilir. Bu vəzifədə 1933-cü ilə qədər, yəni universitet bağlanana qədər pedaqoji fəaliyyətlə məşğul olur.

1918-ci il mayın 28-də Tiflisdə qurulan Azərbaycan Xalq Cümhuriyyəti hökuməti müvəqqəti olaraq Gəncədə fəaliyyət göstərdiyi dövrdə (16 iyun 1918 – 17 sent-

yabr 1918) Osmanlı dövlətindən hərbi yardım istəmiş və Nuru Paşanın rəhbərliyi altında türk ordusu Azərbaycana - Gəncəyə gəlmişdi. Bu dövrdə Əhməd bəy Ağayev (Ağaoğlu), Axund Yusif Talıbzadə ilə yanaşı, Əli bəy Hüseynzadə də Türkiyədən Azərbaycana göndərilmiş, dövlət quruculuğu məsələlərini Azərbaycanın siyasi və hökumət rəhbərləri ilə müzakirə etmiş, müəyyən məsləhətlər vermişdi. Əli bəy Gəncə səfərindən qayıtdıqdan sonra qələmə aldığı və "Qızıl ay" qəzetinin 24 iyul 1918-ci il tarixli nömrəsində çap etdirdiyi "Azərbaycanda düşündüklərim" məqaləsindən öyrənirik ki, o, Gəncəni iyulun ortalarında tərk edərək, Qafqaz məsələsini müzakirə etmək məqsədilə Məhəmmədəmin Rəsulzadə ilə birlikdə İstanbula qayıdıb...

Əli bəy Hüseynzadə Azərbaycan sovet hökumətinin xüsusi dəvəti ilə bir də 1926-cı ildə Vətənə dönüb, Bakıda keçirilən I Beynəlxalq Türkoloji qurultayda iştirak edib. Qurultaya məruzə adı ilə gətirdiyi, əslində isə Xalq Cümhuriyyətinin süqutu və Sovet Rusiyası tərəfindən Azərbaycanın işğalı məsələlərinə həsr olunmuş "Qərbin iki dastanında türk" əsərinin Bakıda nəşrinə nail olub. Onun beynəlxalq miqyaslı belə bir qurultaya dəvət olunması əslində Sovetlər Birliyində də böyük türkoloq kimi tanınması kimi dəyərləndirilməlidir...

Türkoloji qurultay başa çatdıqdan sonra 1926-cı il martın 25-də doğma Vətənindən sonuncu dəfə ayrılan Əli bəy Hüseynzadə bir müddət Atatürkə sui-qəsddə iştirak gərəkçəsi ilə Ankarada İstiqlal Məhkəməsi qarşısında dayanmalı olmuş, az sonra bu işdə günahsızlığı sübut edilərək sərbəst buraxılsa da, fəaliyyətində bir durğunluq mərhələsi başlanmışdı. Bu hadisədən sonra sakit həyat tərzi keçirən, necə deyərlər, qələmi və düşüncəsi "sındırılan" Əli bəy 1940-cı il martın 17-də İstanbulda dünyasını dəyişib və şəhərin Qaracaəhməd məzarlığında haqq dünyasına qovuşub...

Əli bəy Hüseynzadə özündən sonra zəngin elmi, bədii, publisistik irs qoyub getmişdir. Onun elmi, ədəbi-bədii irsi içərisində Bakıda işlədiyi illərdə yazdığı və mütəxəssislər tərəfindən şah əsəri hesab edilən "Siyasəti-Fürusət" ("At minmək siyasəti"), eləcə də, "Füyuzat" məcmuəsi xüsusi yer tutur. Müasiri Yusif Akçura yazırdı ki, Əli bəyin siyasi, fəlsəfi və ədəbi düşüncələrini anlamaq üçün ən qiymətli mənbə "Füyuzat" kolleksionudur (Bax: Y.Akçura. Türkçülüyün tarixi. Bakı, 2006 ).

Şükürlər olsun ki, bu qiymətli mənbə mərhum mətnşünas alim Ofelya Bayramlının fədakar əməyi ilə latın qrafikasına transliterasiya olunaraq tanınmış ziyalı Etibar Yolçuyevin şəxsi vəsaiti ilə məhdud tirajla müasir Azərbaycan oxucusuna çatdırılmışdır. Çox istərdik ki, həmin toplu kütləvi tirajla çap edilərək, geniş elmi ictimaiyyətin istifadəsinə veriləydi...

Bir neçə kəlmə də bu böyük insanın ailə həyatından söz açmaq istərdik. Əli bəy nisbətən gec, yəni 48 yaşında 1912-ci ildə İstanbulda əslən çərkəz olan süvari zabiti Şəmsəddin bəyin qızı Ədhiyyə xanımla (1890-1944) evlənmiş, bu izdivacdan üç övladı-Səlim Turan adlı oğlu, Saidə və Feyzavər adlı iki qızı dünyaya gəlmişdi. Yüksək təhsil almış övladlarının heç birinin uşağı olmayıb. Böyük qızı Saidə bəyim (1914-2002) 2002-ci ildə rəhmətə gedib. Oğlu Səlim Turan (1915-1994) məşhur rəssam idi. Parisdə yaşayıb, 1994-cü ildə orada dünyasını dəyişib. Üçüncü övladı 1920-ci ildə doğulmuş Feyzavər bəyim bu yaxınlarda İstanbulda haqq dünyasına qovuşub. Əli bəyin nəsil davamı bu övladlarla bitir...

Əli bəy Hüseynzadə XIX əsrin sonu – XX əsrin əvvəllərində türk-islam dünyasının yetirdiyi nadir şəxsiyyət, dahi mütəfəkkir, bənzərsiz fikir adamı, böyük maarifçi və ictimai xadim idi...Onun haqq dünyasına

qovuşmasından 74 il ötsə də, o, əsərlərində, əməllərində, parlaq ideyalarında bu gün də yaşayır. Bu böyük İnsanın adının əbədiləşdirilməsi istiqamətində müstəqil Azərbaycanda dövlət tərəfindən müəyyən addımlar atılıb, doğulduğu Salyan şəhərində şərəfinə heykəli ucaldılıb, küçələrə, məktəblərə adı verilib. Əsərləri çap edilib, haqqında araşdırmalar aparılıb. Ən başlıcası təmiz adı özünə qaytarılıb, böyük ideyaları həyata keçirilib. Hesab edirik ki, necə ki, müstəqil Azərbaycanın üçrəngli bayrağı var, həmin bayrağın rənglər simvolikasının müəllifi Əli bəy Hüseynzadə də var olacaqdır...

Əminik ki, müstəqil Azərbaycanın görkəmli elm və mədəniyyət xadimləri maarif və mədəniyyətimizin bu böyük korifeyinin üçrəngli bayrağımızda əbədiləşən milli ideyaların müəllifi Əli bəy Hüseynzadənin 150 illik yubileyinin keçirilməsi haqqında ölkə Prezidentinin məlum Sərəncamının yüksək səviyyədə icrası üçün əllərindən gələni əsirgəməyəcək, bu böyük ziyalının zəngin irsinin xalqımıza, xüsusən də müasir Azərbaycan gəncliyinə gərəyincə və yetərincə çatdırılmasına öz layiqli töhfələrini verəcəklər.

**İstifadə edilmiş ədəbiyyat**

1. Əli bəy Hüseynzadə. Seçilmiş əsərləri. Bakı, 2007 (Tərtib edəni: Ofeliya Bayramlı).

2. Əli bəy Hüseynzadə. Seçilmiş əsərləri. Bakı, 2008, 2 cilddə (Tərtib edəni: Ofeliya Bayramlı).

3. Füyuzat (1906-1907). Bakı, 2006 (Transliterasiya edəni, çapa hazırlayanı və ön sözün müəllifi Ofeliya Bayramlı).

4. Azər Turan. Əli bəy Hüseynzadə. Moskva, 2008.

5. Manaf Süleymanov. Eşitdiklərim, oxuduqlarım, gördüklərim... Bakı, 1996.

6. Yusuf Akçura. Türkçülüyün tarixi. Bakı, 2006.

7. Ziya Gökalp. Türkçülügün esasları. İstanbul, 1996.

**А.Кулиев**

**Али бек Гусейнзаде – один из корифеев – просветителей Азербайджана**

**Резюме**

В статье говорится об исторических заслугах Али бека Гусейнзаде, внёсшего ценные предложения в историю педагогической и национальной образовательной мысли Азербайджана. Дается информация о его богатом научном, художественном, публицистическом наследии.

**A.Guliyev**

**Ali beck Husseinzadeh as one of the coryphaeus of Azerbaijan enlightenment**

**Summary**

The article is dedicated to Ali beck Hussinzadeh, the great coryphaeus of Azerbaijan enlightenment, who contributed his valuable, pedagogical thoughts to the history of national education. The information is also given about his rich scientific-publisistic heritage.

# TƏHSİLİN İNKİŞAF STRATEGİYASI: NAİLİYYƏTLƏR VƏ PERSPEKTİVLƏR

**Əlihəsən Həmzəyev**
***Astara Pedaqoji Kollecinin direktoru, fəlsəfə üzrə fəlsəfə doktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *strategiya, texnologiya, insan kapitalı, sosial-iqtisadi.*
***Ключевые слова:*** *стратегия, технология, человеческий капитал, социально-экономически.*
***Key words:*** *strategy, technology, human capital, socio-economic.*

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli sərəncamı ilə təsdiq edilmişdir. Geniş ictimaiyyətin marağına səbəb olan bu dəyərli sənədin məzmunu ilə pedaqoji sahədə çalışan hər bir mütəxəssis dərindən tanış olmaqla yanaşı, əməli fəaliyyətində yeni keyfiyyətlər qazanmağa səy göstərməkdədir.

İqtisadiyyat baxımından orta səviyyəli ölkələr sırasında yer tutan Azərbaycan Respublikası son illər aparılan uğurlu sosial-iqtisadi siyasət nəticəsində dinamik inkişafa nail olmuşdur.

Sənəddə qeyd edilir: "Azərbaycan Respublikasında keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyaya əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə genişmiqyaslı tədbirləri nəzərdə tutur".

Həmin strateji istiqamətlərin tələblərinə uyğun olaraq pedaqoji kadr hazırlığı ilə məşğul olan təhsil müəssisələri öz işini yenidən qurmaq üçün zəruri problemlərlə ardıcıl məşğul olmağa başlamışdır. İlkin olaraq səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılmasına yönəlmiş strateji istiqamətdə təhsilin məktəbəqədər, ümumi, ilk peşə ixtisas, orta ixtisas və ali olmaqla bütün pillələri üzrə kurikulumlarının inkişafı kimi vacib hədəfin əhatə olunması müəllim əməyinin yeni təlim texnologiyaları əsasında elmi təşkilini reallaşdırır. Bu konseptual sənədin qarşıya qoyduğu əsas məqsədə aydınlıq gətirən təhsil naziri cənab Mikayıl Cabbarov müsahibələrin birində demişdir: "Strategiyanın konkret məqsədlərini qeyd etməzdən əvvəl istərdim ki, qısa şəkildə onu zəruri edən səbəblərə toxunam. Yaxın perspektivdə Azərbaycanda təhsilin inkişafını hədəfə alan Dövlət Strategiyasında da əks olunduğu kimi, ümummilli lider Heydər Əliyevin əsasını qoyduğu möhkəm bünövrə və onun layiqli davamçısı möhtə-rəm prezident İlham Əliyevin apardığı ge-nişmiqyaslı sosial-iqtisadi siyasət nəticəsində ölkəmiz hazırda özünün yüksək inkişaf dövrünü yaşayır. Aparılan məqsədyönlü islahatlar ölkəmizi müasir inkişaf səviyyəsinə çatdırmaqla yanaşı, həm də gələcək üçün etibarlı zəmin hazırlamışdır. Azərbaycan artıq yeni dövrə - modernləşdirmə dövrünə qədəm qoyub. Bu dövrün hədəfləri sosial - iqtisadi hə-

yatın qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılmasından, bu yolla davamlı iqtisadi inkişafın təmin olunmasından, eləcə də əhalinin həyat səviyyəsinin daha da yüksəldilməsindən ibarətdir. Xalqımızın müstəqil yaşamaq kimi tarixi haqqının gerçəkləşməsi gələcək inkişaf perspektivlərinin aydın şəkildə müəyyənləşdirilməsinə imkan verir. Güclü və dinamik inkişaf edən Azərbaycanın insan kapitalı müasir dövlətçilik fəlsəfəmizin əsas hədəfidir. Bu hədəflərin gerçəkləşməsi də xeyli dərəcədə təhsilin üzərinə düşür və onun daşıdığı missiya ilə bağlıdır” (“Azərbaycan” qəzeti, 03.11.2013).

Biz təhsil işçiləri məqsədlə bağlı gətirilən aydınlıqdan dərk edirik ki, insan kapitalı ilə əlaqədar problemlər strateji istiqamətlər üzrə keçirilən tədbirlərdə öz həllini tapacaqdır.

Təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi, təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılması, müasir tələblərə uyğun və ömürboyu təhsilin təmin edilməsi, Azərbaycan Respublikasında iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə eyni səviyyəyə uyğun təhsil sisteminin maliyyələşdirilməsi modelinin qurulmasını həyata keçirən mexanizmlərin formalaşdırılması bütövlükdə strategiyanın qarşıya qoyduğu məqsədlərə xidmət edir.

Təhsil sahəsində beynəlxalq təcrübə, Azərbaycan Respublikasında təhsilin vəziyyəti, təhsil sisteminin başlıca vəzifələri, strategiyanın məqsədi, strateji istiqamətlər, hədəflər və tədbirlər, strategiyanın həyata keçirilməsi ilə əlaqədar görüləcək işlər konseptual sənəddə ehtiva olunmuşdur. Sənəddə təsbit olunan, strateji səciyyə daşıyan məsələlərin hər biri müəllimdən səriştəlilik və peşəkarlıq nümayiş etdirməyi vacib sayır.

Müəllimlərin əmək haqlarının səriştə və nəticələr əsasında artırılması onların maddi motivasiyasının yaxşılaşdırılması məqsədi güdür. Təhsil tarixində əlamətdar hadisə olan strategiya geniş sahəni əhatə edərək, onun həyata keçirilməsi üçün hazırlanacaq fəaliyyət planında icra olunan tədbirlərdə hər bir müəllim öz töhfəsini verməlidir.

Ölkədə ən yeni texnologiyalara əsaslanan, təhsili yeni əsaslarda quran, keyfiyyət nəticələrinə görə dünya ölkələri sırasında qabaqcıl yer tutan, iqtisadi baxımdan dayanıqlı təhsil sistemini yaratmağa xidmət göstərən strategiya təhsilin rolunu artıraraq hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə insan resurslarının inkişafını ön plana çəkir.

Son illərdə ölkədə təhsilin inkişafı ilə əlaqədar mühüm işlər görülmüş, təhsilin normativ hüquqi bazasının təkmilləşdirilməsi, maddi-texniki təminatı sahəsində ölkə başçısının sərəncamları əsasında geniş tədbirlər həyata keçirilmişdir. Müxtəlif şəhər və rayonlarda 2500-ə yaxın məktəb binası tikilib və mövcud təhsil obyektlərində əsaslı təmir-bərpa işlərinin aparılması, həmin müəssisələrdə informasiya-kommunikasiya texnologiyalarının uğurla tətbiqi əhəmiyyətli dərəcədə genişlənib.

Astara Pedaqoji Kollecin kollektivinin və eləcə də maddi-texniki bazanın sosial-iqtisadi cəhətdən dinamik inkişafında dövlətin diqqət və qayğısı xüsusilə qeyd olunmalıdır. Bir vaxtlar normal tədris aparmağa şəraiti olmayan kollecdə indi yüksək standartlara uyğun səviyyədə İKT-dən istifadə etmək imkanı vardır.

Təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətlərinin müasir tələblərə uyğun yüksəldilməsi, müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsilə pedaqoji fəaliyyətin keyfiyyətcə

qaldırılması gözlənilən nəticələrdəndir.

Azərbaycan təhsilinin dünəni, bu günü və gələcək perspektivlərini ehtiva edən inkişaf strategiyası bu sahədə tənzimləmə, idarəetmə və nəzarət funksiyalarının dəqiq müəyyənləşdirilməsini vacib sayır.

Müəllimin səriştəliliyi və peşəkarlığı ilk növbədə onun təlim prosesində yeni pedaqoji texnologiyalardan bacarıqla istifadə etməsi ilə şərtlənir. Aparılan təcrübələrin nəticəsi göstərir ki, təhsil sisteminin inkişafının əsas strategiyası tələbə şəxsiyyətinin diqqət mərkəzində qalması, tədris prosesində öyrədənin ona münasibətini dəyişməsindən ibarətdir. İnkişaf etmiş ölkələrdə təhsil öyrənən-dərslik-öyrədən sistemində qurulmuşdur. Dərsin yeniləşməsi fəal təlim texnologiyalarının prosesə tətbiqinə düz mütənasib olub, əsaslı surətdə asılıdır.

Görkəmli pedaqoq-alim S.P.Kapitsaya görə, təhsil gələcəyə yönəlmiş sənaye sahəsidir.

Strategiyada qeyd edilir: "Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömürboyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir".

Təhsildə pedaqoji texnologiyaları aydın dərk etmək, onun səmərəli inkişafını və tətbiqini təmin etmək üçün ilk növbədə həmin anlayışın mahiyyətini şərh etmək məqsədəuyğundur.

Texnologiya yunan mənşəli söz olub, sənətə sistemli yanaşma kimi başa düşülür. Texnologiya müvafiq sahələrdə biliklər sisteminin tətbiqi nəticəsində xüsusi metodlardan istifadə edərək tapşırığı yerinə yetirmək tərzi olduğu dərk edilir. Texnologiyalar pedaqoji prosesdə öyrənməyin yolunu öyrənməkdə mühüm vasitədir. Müəllimin səriştəliliyi və peşəkarlığı məhz pedaqoji prosesdə müxtəlif texnologiyaların müntəzəm olaraq əlaqələndirilməsinə nail olmaq bacarığı ilə şərtlənir. Bu baxımdan təlim texnologiyasını təhsilin inkişaf etdirilməsi kontekstində insanlara və cəmiyyətə faydalı olan şəxsiyyət formalaşdırmaq funksiyasını reallaşdıran kimi də ifadə etmək olar.

Müəllim hazırlığında mühüm nəzəri və praktik əhəmiyyət kəsb edən pedaqoji texnologiya V.T.Lixaçova görə, təlim-tərbiyə vasitələrinin pedaqoji-psixoloji quruluşunun forma, metod, üsul və yollarının məcmusu olub, pedaqoji prosesin təşkilati metodik alətidir.

Pedaqoji texnologiya anlayışı qeyri-xətti mahiyyət daşıdığı üçün yanaşmalar fərqlidir. Məsələn, V.P.Bespalko pedaqoji texnologiyanı tədris prosesinin reallaşmasının texniki məzmunu hesab edir.

İ.P.Volkov pedaqoji texnologiyaya təlimdə əldə olunmuş yüksək nəticələrin planlaşdırma prosesinin təsviri kimi baxır.

G.K.Selevko "Müasir təlim texnologiyaları" kitabında 50-yə qədər pedaqoji texnologiyaların təriflərini vermişdir və s.

Bütün bunlara baxmayaraq yanaşmaları birləşdirən ümumi cəhətlər vardır. Yəni pedaqoji texnologiya prosessual kateqoriya olub, bilavasitə tədrislə bağlıdır.

Müasir təhsil konsepsiyasında yeni pedaqoji texnologiyaların tədris prosesinə tətbiqi təlimin yeni üsullarla həyata keçirmək zərurətindən irəli gəlir.

Təhsil sistemində müəyyən olunan yeni texnologiyalardan biri də şəxsiyyətə yönəlmiş təlim texnologiyasıdır. Bu təlim texnologiyasının mahiyyəti pedaqoji prosesdə öyrənənin mərkəzi fiqur kimi görünməsini təmin etməkdir.

Təhsil sisteminin başlıca vəzifələrini müəyyən edən dövlət strategiyası ölkənin dinamik inkişafı üçün yeni mərhələdir. İnsan kapitalının inkişafı, hər bir şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi, insan resurs-

larının inkişafı, səriştəli müəllim, təhsil menecerlərinin yetişdirilməsi, qabaqcıl texnologiyaların mənimsənilməsi, 12 illik təhsilə keçid, peşəkarlığa əsaslanan stimullaşdırıcı əmək haqqı sisteminin formalaşdırılması, ali və ümumi təhsil üzrə dərsliklərin elmi və metodik baxımdan təkmilləşdirilməsi və bir çox mühüm strateji istiqamətlərin səviyyəsi barədə sənəddə qeyd edilir: “Azərbaycanın təhsil sistemi iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sisteminin standartlarına uyğun olmalıdır”. Biz təhsil işçiləri bu konseptual ideyanın tələblərinə uyğun olaraq pedaqoji fəaliyyətimizdə əsaslı dönüş yaratmaqla hədəflərə çata bilərik.

*Rəyçi: baş redaktor müavini N.Musayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. “Azərbaycan məktəbi”, 2013, № 5.
2. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarovun məruzəsi (Azərbaycan Müəllimlərinin XIV qurultayının materialları), “Azərbaycan məktəbi”, 2014, № 1.
3. Ağayev Ə. Təlim prosesi: Ənənə və müasirlik. Bakı, 2006.
4. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı, 2001.
5. Mehrabov A. və b. Pedaqoji texnologiyalar. Bakı, 2006.
6. “Azərbaycan məktəbi” jurnalı, 2013, № 5.
7. “Azərbaycan” qəzeti, 2013, 3 noyabr.

**А.Гамзаев**

**Стратегия Развития Образования: успех и перспективы**

**Резюме**

В статье прокомментированы вопросы необходимости соответствия мировым стандартам таких понятий, как компетентность работников образования, профессионализм, технологии, направленне на развитие личности и многих других важных факторов, возникающих в связи с требованиями Государственной Стратегии Азербайджанской Республики по развитию образования.

**A.Hamzayev**

**Strategy of Education Development: achievements and prospects**

**Summary**

In this article it is spoken about the role of information technologies in the development of education and forming personality. Many important factors and requirements according to the State Strategy are also noted here, which serve to enhance of competency and professionalism of teachers.

# TƏHSİLİN İNKİŞAFINDA YENİ MƏRHƏLƏ

**Akif Xalıqov**
***Lənkəran şəhər S.Kazımbəyov adına 6 nömrəli tam orta məktəbin direktoru, fəlsəfə doktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *təhsil, strategiya, kurikulum, müəllim hazırlığı, idarəetmə, kompetensiya.*
***Ключевые слова:*** *образование, стратегтя, курикулум, подготовка учителя, управление, компетенция.*
***Key words:*** *education, strategy, curriculum, teacher preparation, management, competency.*

Tarixin bütün mərhələlərində təhsil problemləri dövlətin, cəmiyyətin diqqət mərkəzində olmuşdur. Hər bir tarixi dövrdə cəmiyyətin tələbatına uyğun olaraq təhsil sistemi formalaşdırılmış, müvafiq mexanizm əsasında məktəb və təhsil məsələləri həll edilmiş, ayrı-ayrı sahələr üzrə mütəxəssislər hazırlanmışdır. Müxtəlif tarixi dövrlərdə təhsil dövlətlərin siyasi maraqlarını əks etdirməyə yönəlsə də, ümumiyyətlə, cəmiyyətin inkişafında mühüm rol oynamışdır.

Bu gün Azərbaycan Respublikası müstəqil dövlətdir. Onun özünün müstəqil təhsil sistemi formalaşdırmışdır. Ölkəmizdə təhsilin məzmunu demokratik, humanist dəyərlərə əsaslanır.

Hazırda Avropa təhsil məkanına inteqrasiya olunan Azərbaycanın təhsil sferasının qarşısında duran ən başlıca vəzifəni təhsildə yeni tədris mexanizmlərinin işlənməsi, bu sahənin qabaqcıl texnologiyalar əsasında inkişaf etdirilməsi, keyfiyyətin yüksəldilməsi və tədris prosesində innovasiyaların tətbiq edilməsi təşkil edir. Son illər təhsil sistemində İKT-nin tətbiqinin dünya standartları səviyyəsinə çatdırılması məsələsi dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilmişdir. Hazırda bu istiqamətdə görülən tədbirlər çərçivəsində gənc nəslin innovativ inkişafında böyük önəm kəsb edən müasir təhsil mühitinin yaradılması, informasiya cəmiyyətinin yeni tədris modeli olan distant təhsilin, fasiləsiz pedaqoji təhsilin tətbiqi istiqamətində işlər aparılır.

Gənc nəslin müasir dövrün tələblərinə uyğun formalaşmasında başlıca rol oynayan təhsil sistemində modernləşmə strategiyasının həyata keçirilməsi hər bir sivil dövlətin gələcək müqəddəratını müəyyən edən taleyüklü məsələlərdəndir. Təhsildə qabaqcıl informasiya texnologiyalarının imkanlarından geniş istifadə etməklə innovativ inkişafa nail olunması, bu sahədə yüksəkixtisaslı kadrların hazırlanması, bir sözlə, innovativ təhsil modelinin qurulması prioritet istiqamətlərdəndir.

Bəşəriyyət yaranan gündən bu günə qədər cəmiyyətdə baş verən hadisələr mürəkkəbləşdikcə, insanların məlumat dairəsi genişləndikcə öyrətmə və öyrənmə də müvafiq olaraq formasını dəyişmiş, daha sistemli, mükəmməl xarakter almağa başlamışdır. Bu mənada artıq 6-cı ildir ki, ölkəmizdə tətbiq olunan kurikulum islahatı obyektiv zərurətdən irəli gəlmişdir.

Kurikulum islahatı mərhələli proses olmaqla innovasiyalara əsaslanan, əvvəlcədən müəyyən edilmiş, real nəticələrə istiqa-

mətlənmiş, geniş fəaliyyət mühitinə çevrilməkdədir. XXI əsr təlimin məqsədinin dəyişdirilməsini və təhsil sistemində səriştəyə əsaslanan yanaşmanın tətbiqinin geniş miqyasda həyata keçirilməsini aktuallaşdırdı. Ölkənin davamlı tərəqqisi baxımından insan resurslarının inkişafı məsələsinə xüsusi əhəmiyyət verdiyini önə çəkən təhsil naziri M.Cabbarovun “Sizlərlə həm işgüzar insan, həm fəal vətəndaş, həm də bir valideyn kimi danışmaq, gələcəyimiz olan uşaqların və gənclərin həyatında təhsilin rolunu müzakirə etmək və dəyərləndirmək istərdim”, - fikri şagirdlərimiz üçün nə qədər keyfiyyətli təhsil mühitinin yaradılmasından xəbər verir. Biz müəllimlər də bunu görür, eyni zamanda öz məsuliyyət və borcumuzu dərk edirik. Zaman keçdikcə bu gündən sabaha yeniləşən və müasirləşən təhsilimiz ötən əsrin sonlarının monoloji mədəniyyətindən dialoji mədəniyyətə keçidin, yəni XXI əsrin xüsusiyyətlərini özündə əks etdirdiyindən mədəniyyətin tərkib hissəsi kimi təhsilin forma və məzmununun təkmilləşdirilməsi zəruriyyəti meydana çıxır. Təhsildə mövcud problemlər o zaman öz həllini tapa bilər ki, məqsəd aydınlığı olsun, yəni hədəfə çatma istiqamətində atılan hər bir addım strateji bir məsələnin həllinə yönəlmiş olsun.

İslahat proqramının qəbul edilməsindən keçən müddət ərzində ölkəmizdə təhsil yüksələn xətt üzrə inkişaf edir. Təhsilin məzmunu, müasir təlim texnologiyalarının, təlim metodlarının təkmilləşdirilməsi istiqamətində sistemli işlər görülür, layihələr həyata keçirilir. Tədrisin təşkili və müəllimlərin hazırlığı ilə bağlı görülmüş işlərə gəlincə, düşünürük ki, bu istiqamətdə işlər daha da təkmilləşdirilməlidir. Müəllimlərin yeni fənn kurikulumlarının tətbiqi ilə bağlı 10 günlük təlim kurslarından keçməsi hələ onların hazırlığına tam təminat verə bilmir. Sadəcə onlara işin mexanizmi ilə bağlı onlara ilk metodik yardım göstərilir. Bu işin mərkəzində məktəbin durması məqsədəmüvafiq olardı. İstər ixtisasartırma, istərsə də müxtəlif treninq və seminarlarda müəllimlərin iştirakı, innovativ texnologiyalara yiyələnmələri, İKT üzrə yeni proqramların tədris prosesinə gətirilməsi, məktəbdə metodik mərkəzlə canlı əlaqənin təşkili yaxşı olardı.

L.Vıqotski hələ 30-cu illərdə qeyd edirdi ki, təlim hökmən şagirdin inkişaf sürətini qabaqlamalı və inkişafı öz arxasınca aparmalıdır. VI siniflərdə oxuyan şagirdlərin sürətli inkişafı bu günün tələbinə cavab vermir. Metod və metodikanı məktəbdə tənzimləyən yeganə orqan fənn metodbirləşmələridir ki, bu da öz fəaliyyətini iş planlarını yeniləşdirməkdə görür. Araşdırmalar göstərir ki, sivilizasiyaya dair biliklər toplusunun həcmi zamandan asılı olaraq eksponensial qanunla artırdı. Avropada X əsrdən başlayaraq hər 100 ildə institutların sayı təxminən iki dəfə artır. O cümlədən bura müxtəlif elm sahələri də daxildir. Ona görə də yetişən gənc nəsil, nəinki reallıqları təsvir etməyi bacarmalı, eyni zamanda onu səmərəli dəyişdirməyi öyrənməlidirlər.

Bu iş öz sistemliliyi ilə diqqəti çəkməlidir. Məktəb metodbirləşməsinin işində aşağıdakı tədbirlərin nəzərə alınması daha məqsədəmüvafiq sayılır:

1. Metodbirləşmənin işinin təkmilləşdirilməsi.

• Sədrin düzgün seçilməsi;

• Treninqlərin keçirilməsi;

• İş planının dəyişdirilməsi (interaktiv iclaslar təşkil etmək, kurikulum islahatını, müəllim kontingentini nəzərə almaqla minimum və maksimum vəzifələrin müəyyənləşdirilməsi);

• İş təcrübəsi ilə bölüşmə (açıq dərslər, qarşılıqlı dərs dinləmə, şagird yaradıcılığına baxış, təqvim-tematik planına yaradıcı yanaşma, metodiki seminarlar və s.);

• Refleksiya metodu ilə yeni yanaş-

manın tətbiqi;

• Tədris proqramlarının təhlili və təkmilləşdirilməsi;

• Müəllim yaradıcılığının rəğbətləndirilməsi;

• Dərslər üzrə mediatekanın və məlumat bazasının yaradılması;

• Mentorluğun həyata keçirilməsi.

2. Monitorinqin və qiymətləndirmə tədbirlərinin keçirilməsi (meyar və göstəricilər, mexanizmlər, vasitələr).

3. Valideynlərin maarifləndirilməsi və icmanın cəlbi.

4. Maddi-texniki bazanın inkişafı (İKT, elektron lövhələr, internet, əyani vəsaitlər, mükəmməl kitabxana, inkişafetdirici tədbirlər üçün maddi imkanlar, laboratoriyalar, nəqliyyat vasitəsi).

5. Kadr potensialının inkişafı (treninq, daxili attestasiya, reytinq əmsalının hazırlanması, açıq dərslərin təhlili, kliniki müşahidə və mentorluq, kurslara cəlbolunma, beynəlxalq və məktəblərarası mübadilə).

6. Dərsdən sonrakı fəallıq.

7. İnteraktiv təlimin tətbiqi (treninqlərdə iştirak, məşqçilərin formalaşdırılması, F\T metodiki resurs bazasının yaradılması, dərsdinləmə və seminarların keçirilməsi, digər məktəblərə səfərlərin təşkili, rəğbətləndirmə üsullarının tətbiqi).

Müəllim əməyinin stimullaşdırılmasında bu metodik imkanların strateji istiqamətlərdən biri kimi nəzərə alınması təcrübədə özünü doğruldur. Müəllimlərimizin fikrincə, tədris prosesinin zəif təşkili heç də əməyin stimullaşdırılması ilə bağlı deyildir. Müəllimin metodik hazırlığına və onun sistemli təşkilinə ciddi əməl olunmaqla, hər bir müəllimə təlim fəaliyyətinin nəticəsinə görə əmək haqqının verilməsi daha məqsədəmüvafiq olardı. Şagirdlərin inkişafında təminat yoxdursa, müəllim üçün də son nəticə yoxdur. Ona görə də ilk zəif nəticəyə görə müəllimə dərs yükünün minimum məbləği qədər əmək haqqı ödənilsə, bu, ikinci dəfə təkrar olunarsa, iş yerinin itirilməsi təhlükəsi nəzərdə tutulsa, məsuliyyət hissi daha da artar. Beləliklə də, səriştəyə əsaslanan müəllim ideyası öz həllini tapar. Bu gün yaxşı müəllim səriştəlidir, aldığı əmək haqqı staja görə verilir. Bu model hamıya şamil olduğu üçün yaradıcı müəllim amilindən danışmaq çətindir. Yaxud tədris metodlarının tətbiqi istiqamətində səriştəliliyi ilə seçilən müəllimlərə nəticə etibarilə müsbət göstəriciləri olmayan müəllimlərlə eyni yanaşma tərzi təzadlı vəziyyət yaradır. Dövlət Strategiyasında strateji istiqamətlərdən biri kimi səriştəyə əsaslanan və şəxsiyyətyönümlü təhsilin məzmununda bu hədəfin yer alması aktualdır. Strateji istiqamətin növbəti hədəfi idarəetmənin yenidən qurulması ilə bağlıdır. Təhsildə nəticələrə görə cavabdehlik mövcud strateji istiqamətlərdən birinin üzərinə düşür. Təhsilin idarə edilməsində elmi-metodik cəhətdən səriştəli olan, məktəb metodmərkəzinin işinin canlı təşkilinə nail olmağı bacaran və bu işin sistemli inkişafını təmin edən bir modelin işlək mexanizminin olması vacibdir. Təhsilin keyfiyyətinə görə cavabdehliyin idarəetmə mexanizminin düzgün qurulmasından asılı olduğunu hər bir təhsil işçisi görür. I-VI siniflərdə fənn kurikulumlarının tətbiqi təhsilin məzmunu istiqamətində ən yaxşı tədbirlərimizdən hesab olunsa da, qiymətləndirmə mexanizminin hələ tam səviyyədə işlək olmaması görülmüş işlərə müəyyən mənada kölgə salır.

Möhtərəm Prezidentimiz İlham Əliyevin dəstəyi ilə hər il keçirilən "Ən yaxşı müəllim", "Ən yaxşı ümumtəhsil məktəbi" müsabiqələri innovativ təlim metodlarının tətbiqinə geniş imkanlar açmışdır. Ona görə də bu işin yerlərdə kütləviləşməsi istiqamətində səylər daha da artırılmalıdır. Bu metodik imkanların sistemli təşkili müəllim əməyinin stimullaşdırılmasına geniş imkanlar aça bilər. Təhsil işçisi ancaq təhsil işi ilə

məşğul olmalıdır ki, bu da işin daha keyfiyyətli təşkilinə səbəb olsun. Respublikamızda informasiya və kommunikasiya texnologiyalarının tətbiqi istiqamətində görülmüş tədbirlərdən biri də "Elektron məktəb" layihəsi çərçivəsində elektron məktəblərin yaradılmasıdır. Lakin bu layihənin həyata keçirilməsi mexanizminin düzgün təşkili, mütəmadi olaraq dövlətimiz tərəfindən məktəblərə verilmiş bu qədər avadanlıqlardan səmərəli istifadə olunması istiqamətində əhəmiyyətli işlər görülməli, xüsusi tədbirlər planı işlənib hazırlanmalıdır. Zənnimizcə, təkcə məktəbin maddi-texniki bazasını zənginləşdirmək problemlərin tam həlli demək deyildir. Müəllim hazırlığı, onun peşəkar səviyyəsinin yüksəldilməsi, idarəetmənin strukturunda strateji istiqamətlərin

| | **Müəllimin fəaliyyətinin qiymətləndirilməsi** | **Müsbət** | **Orta** | **Mənfi** |
|---|---|---|---|---|
| | **Müəllimin peşə xüsusiyyətlərinin qiymətləndirilməsi** | | | |
| | *Nitq* | | | |
| | *Münasibət* | | | |
| | *Geyim* | | | |
| | *Jest* | | | |
| | *Obyektivlik* | | | |
| | *Maraqlı resursların seçilməsi* | | | |
| | *Fasilitasiya bacarığı* | | | |
| | *Mövzunun standarta uyğunluğu* | | | |
| | *Öyrədici mühiti yaratmaq bacarığı* | | | |
| | *İnteqrasiya* | | | |
| | *Müasir həyatla əlaqə bacarığı* | | | |
| | **Motivasiya mərhələsi üzrə qiymətləndirmə kriteriyaları** | | | |
| | *Maraqlı* | | | |
| | *Əyanilik* | | | |
| | *Elmilik* | | | |
| | *Texniki* | | | |
| | *Uyğun* | | | |
| | *Düzgün ifadə formasının seçilməsi* | | | |
| | **Tədqiqat sualı** | | | |
| | *Problemli, düşündürücü* | | | |
| | *Lakonik* | | | |
| | *Mövzu ilə bağlılıq* | | | |
| | *Aydın* | | | |
| | **Tədqiqat işi** | | | |
| | *Tədqiqat sualına uyğunluq* | | | |
| | *Uyğun formanın seçimi* | | | |
| | *Müasir metodlardan istifadə* | | | |
| | *Təfəkkür əməliyyatlardan istifadə* | | | |

| | | | | |
|---|---|---|---|---|
| | Əyanilik | | | |
| | Dərin tədqiqatçılıq | | | |
| | Tədqiqat işinin səviyyəsi | | | |
| | Yaş səviyyəsinə uyğunluq | | | |
| | Mövzunun əhatəliliyi | | | |
| | Müəllimin əməyi | | | |
| | Müəllimin yaradıcılığı | | | |
| | **Müzakirə** | | | |
| | Bütün qrup və şagirdləri müzakirəyə cəlbetmə bacarığı | | | |
| | Qrupların təqdimatı zamanı tədqiqat işinə uyğun sualın seçilməsi.Yönəldici sualların seçimi | | | |
| | Dəstəkləyici mövqeyi | | | |
| | **Ümumiləşdirmə** | | | |
| | Müəllimin düzgün ümumiləşdirmə aparma bacarığı | | | |
| | Yönəldici sualları seçim bacarığı | | | |
| | Ümumiləşdirmə üçün orijinal seçim forması | | | |
| | Nəticədə aydın, düzgün ifadə formasının seçilməsi | | | |
| | Maraqlı, yaradıcı tətbiqetmənin seçimi | | | |
| | Düzgün, obyektiv, real, mövzuya uyğun qiymətləndirmə formasının seçimi | | | |

mexanizminin düzgün müəyyənləşdirilməsi, müəllimin və məktəbin reytinqinin təyin edilməsi, eləcə də məktəbdə müəllimin fəaliyyətinin dəyərləndirilməsi üçün dövlətin müvafiq standartlarına uyğun müvafiq meyarların olması vacibdir. Təlimin nəticələri, müəllimin peşəkarlığı, idarəetmənin səviyyəsi bu meyarların süzgəcindən keçirilsə, arzu olunan nəticələri daha tez əldə etmiş olarıq. Düşünürük ki, bu meyarlar xüsusi ekspert qrupu tərəfindən hazırlanmalıdır. Müəllimin peşə xüsusiyyətlərinin qiymətləndirilməsində aşağıdakı meyarların olması məqsədəuyğundur.

Bu meyarlar, əsasən, təlimçilərin seminarında, Bakı Avropa liseyində hazırlanmışdır.

Təhsil öz inkişafının yeni mərhələsinə qədəm qoymuşdur. Burada insan amilinin vasitə yox, məqsəd olması fikri öz dolğunluğunu ölkə Prezidenti cənab İlham Əliyevin müdrik kəlamında tapır. “Biz iqtisadi kapitalımızı insan kapitalına çevirməliyik”. Ona görə də müəllimin inkişafı onun təhsilindən başlayır. Yaşadığımız rəqəmsal qlobal dünyada hər bir Azərbaycan müəllimi şagirdə aldığı informasiyanı biliyə çevirməyi təlqin etməyi, öyrənməyi öyrətmək bacarığını inkişaf etdirməli, zamanın tələbinə uyğun bilik, bacarıq və qabiliyyətləri formalaşdırmalıdır. Bu baxımdan, hər bir müəllim öz işində yaradıcı və təşəbbüskar olmalıdır. Çünki qloballaşan dünyada bilik və yeni texnologiyalar olmadan uğur qazanmaq mümkün deyil. Bu hədəfə çatmaq üçün öhdəmizə götürdüyümüz vəzifəni səylə yerinə yetirməyə borcluyuq. Bu borcu kim yerinə yetirə bilər?. İndiki dönəmdə işlənən bir ifadə ilə desək, - səriştəli müəllim. Bəs səriştəli müəllim kimdir? Müasir təlim texnologiyalarına yiyələnən, fəal təlim metodlarını tətbiq etməyi bacaran, şagirdlərlə sistemli iş quran,

proqram və dərsliklər üzərində müstəqil iş aparmağı bacaran şəxs. Bu da təbiidir. Çünki peşəkar müəllim elə mütəxəssisdir ki, peşə normalarını bilir, qarşısına müstəqil məqsəd qoyur, öz təşəbbüsü ilə peşə qabiliyyətini inkişaf etdirir, yüksək motivasiya və özünütənzim səviyyəsinə malik olur, öz fəaliyyətini düzgün idarə etməyi bacarır. Peşə bacarıqlarına ixtisas (fənn) bacarıqlarından daha çox şəxsiyyət keyfiyyətləri daxildir. Peşə bacarığına malik olan müəllim pedaqoji fəaliyyətini, ünsiyyətini tələb olunan səviyyədə həyata keçirir, şagirdlərin təlim və tərbiyəsi işində yüksək nəticələr əldə edir.

Beləliklə, peşə bacarığının inkişafı dedikdə, müəllimin şəxsi yaradıcılığının inkişafı, yeniliyi qəbul etmək sahəsində formalaşması, ixtisasını, fənnini, onun tədrisi metodikasını və uşaq psixologiyasını dərindən bilmək əsasında pedaqoji innovasiyaları dərk etməsi və tətbiq etmək bacarığı başa düşülür. Müəllimin peşə bacarığının yüksəldilməsi təhsilin, təlim və tərbiyənin keyfiyyətini yüksəltməyin əsas şərtlərindən biridir. Yüksək peşəkarlıq qabiliyyətinə malik olan müəllimlər isə ümumi müəllimlərin az hissəsini təşkil edir. Deməli, əksər müəllimlər müasir tələblərdən geri qalır. Bu problemlərin aradan qaldırılması üçün Strategiyada istiqamətlər, hədəflər və tədbirlər müəyyənləşdirilmişdir. Yeni strateji sistemin yaradılmasında müəllim aparıcı rola malikdir. Strategiyada qeyd edildiyi kimi, müəllim amili təhsilalanın öyrənməsi və inkişafı, nailiyyətlərinin monitorinqi prosesində həlledici rol oynayır. Təhsilalanın savadlı və şəriştəli şəxs kimi formalaşmasına müəllimin təsiri onun akademik bacarığından, tədris təcrübəsindən və peşəkarlıq səviyyəsindən asılıdır. Müəllimin bu keyfiyyətləri ilə təhsilalanların nailiyyətləri arasında sıx korrelyasiya mövcuddur. Elə buna görə də tarix boyu müəllimin cəmiyyətdə oynadığı rol müsbət qiymətləndirilmişdir. Lakin dövr yeniləşdikcə onun funksiyalarına tələblər dəyişir. Ona görə də müəllim hazırlığına son dövrlərdə diqqət və tələbkarlığın artırılması təbii qəbul edilməlidir. Təhsilin nəticələrə görə tənzimlənmə mexanizminə malik idarəetmə sisteminin formalaşdırılması da təhsilimizin inkişafında strateji hədəf olaraq dəyərləndirilir. Hesab edirik ki, arzuolunan nəticəyə nail olmaq üçün strategiyanın uğurlu həyata keçirilməsini təmin edəcək effektiv icra mexanizmi ilə yanaşı, konkret olaraq hər bir təhsil işçisi bu işə öz töhfəsini verməlidir. Təhsilimizin yeni inkişaf mərhələsinə öz münasibətimizi bildirmək istəyimiz də bu məqsəddən irəli gəlir. Müəllimlərlə metodik işin təşkilində, məktəbin fəaliyyətinin qiymətləndirilməsində, idarəetmə sistemində məktəb rəhbərlərinə hansı kompetensiyaların vacib olmasına aşağıdakı amillər də az kömək etmir.

• Müəllimlərin kurslardan keçməsi onların səriştəsinin artırılması üzrə ehtiyaclarının müəyyənləşdirilməsini tamamlayır.

• Şəxsiyyətlərarası münasibətlərin obyektiv şəkildə qurulmasına kömək edir.

• Fəaliyyətlərin ehtiyaclara uyğun planlaşdırılmasını şərtləndirir.

• Qarşıya çıxan problemləri çevik və səmərəli həll etməkdə təcrübə mübadiləsi olur.

• Qanun, qayda və təlimatları yaradıcı tətbiq edilməsi üçün baza rolunu oynayır.

• Texniki resurslarla məktəbin təminatı məsələsinin həllində yardımçı olur.

• Təlim prosesini nəzarətdə saxlamağa imkan yaşadır.

• Təhsildə gedən islahatlara çevik uyğunlaşmanı təmin edir.

• Kadr təminatını və dərs bölgüsünü demokratik və ədalətli prinsiplərlə həll etmək təcrübəsi qazanılır.

• Şagirdlərin təlim nəticələrinə nəzarət güclənir.

• Müəllim və şagirdləri öz işlərinə sti-

mullaşdırır.

• Valideynləri təhsildəki yeniliklərlə tanış edir və onları məktəb işinə cəlb edir.

• Təcrübə mübadiləsi nəticəsində məktəbdə monitorinq sistemi yaranır.

• İstedad bankının əsası qoyulur.

• Digər məktəblərlə əlaqələr genişlənir.

• Müəllimlər üçün davamlı məktəbdaxili treninqlərə imkan yaranır.

• Şagirdlərin özünüidarəetmə orqanlarının təşkili mümkün olur.

• Metodbirləşmələrin işində islahatlarla bağlı məsələlərin əks olunması təmin edilir.

Strategiyada müasir tələblərə uyğun və fasiləsiz təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasını ölkəmizdə maddi kapitalın insan kapitalına çevrilməsi istiqamətində sistemli və məqsədyönlü işin nəticəsi hesab etməklə təhsilin inkişafında yeni və mühüm bir mərhələ kimi qiymətləndiririk.

*Rəyçi: dos. R.Qəndilov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.

2. Təhsil naziri Mikayıl Cabbarovun Xəzər Avropa İnteqrasiya İşgüzar Klubunun üzvləri ilə görüşü. // Azərbaycan müəllimi, 6 dekabr, 2013.

3. Təhsil sistemi milli dəyərlərə və peşəkar kompetensiyalara malik Azərbaycan vətəndaşı yetişdirməlidir. // Azərbaycan məktəbi, № 5, 2013.

4. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Monoqrafiya. Bakı: Mütərcim, 2011.

5. Kərimov Y. Təlim metodları. Bakı: RS Poliqraf, 2010.

6. Rzayev O. və b. Təhsilin idarəolunmasının əsasları. Bakı: Mütərcim, 2010.

**А.Халыгов**

**Государственная Стратегия новый этап в развитии образования**

**Резюме**

В статье подчеривается, что Государжвенная Стратегия является новым этапом в развитии образования. Отмечается что построение инновационной учебной модели с использованием современных, информационных технологий в образовании-одно из приоритетных направлений. Говорится и о ведущей роли учителя в создании новой стратегической системы.

**A.Khaligov**

**State Strategy is a new stage in the development of education**

**Summary**

In the article it is noted that state strategy is a new stage in the development of education. Innovative education model has been created by using information technologies. Teachers have played leading role in creating new strategy.

***Pedaqogika və pedaqogika tarixi***

# MÜƏLLİM HAZIRLIĞINDA SEÇİM PROBLEMİ

**Müseyib İlyasov**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin kafedra müdiri, pedaqogika üzrə elmlər doktoru***

***Açar sözlər:*** *müəllimlik peşəsi, pedaqoji proses, maarifləndirmə, məktəb, şagird.*
***Ключевые слова:*** *профессия учителя, педагогический процесс, просвещение, школа, ученик.*
***Key words:*** *teacher profession, pedagogical process, enlightenment, school, student.*

Müəllim peşəsi müqəddəs, şərəfli və gərəkli peşədir. Xalqımızın ümummilli lideri Heydər Əliyev təhsilə, elmə, məktəbə aid bütün çıxışlarında və nitqlərində müəllim şəxsiyyətinə, müəllim əməyinə və cəmiyyətdə müəllimin roluna böyük dəyər vermiş və onları yüksək qiymətləndirmişdir: “Müəllim sənəti, peşəsi cəmiyyətdə yüksək qiymətə layiq olan bir peşədir. Müəllim olmaq kimi şərəfli bir iş yoxdur. Çünki müəllim xalqın elminin inkişaf etməsinin əsasını qoyanlardır”.

Müəllimlik əbədi və müqəddəs peşədir. Nə qədər ki, cəmiyyət var, öyrətmək var müəllimlik də vardır. Müəllim cəmiyyətin memarıdır. Gələcək cəmiyyət məhz onun əli ilə qurulur. Buna görə də ilk növbədə təhsilimizin qarşısında duran ən başlıca vəzifələrdən biri və birincisi, müəllim hazırlığına diqqətin artırılması, həqiqətən də yüksəkixtisaslı müəllim hazırlığına nail olmaqdan ibarətdir.

Həyat sübut edir ki, o cəmiyyət güclü olur ki, onun müəllimi və təhsili güclü olsun. Müəllim savadlı, öz işini dərindən bilən, peşəsini və uşaqları sevən, öyrənmək və öyrətmək həvəsinə malik və işindən, peşəsindən yüksək zövq alan şəxs olarsa, onun hazırladığı yeni nəsil də yüksək hazırlıqlı, hərtərəfli təhsilli və vətənpərvər şəxslər olar.

Müəllim cəmiyyətin həyatında müstəsna rol oynayır. Ulu öndərin dediyi kimi: “Əgər müəllim olmasa, heç birimiz cəmiyyətdə tutduğumuz yeri tuta bilməz və fəaliyyət göstərə bilmərik.” Buna görə də “...hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır”.

Lakin müəllimlik peşəsini seçənlərin bu peşəyə münasibətləri heç də nikbinlik yaratmır. Xalqımız müəllimlik peşəsini, müəllimi həmişə əziz tutmuş və ulu öndərin dediyi kimi, “Azərbaycanda müəllimə daim böyük hörmət olmuşdur. Müəllim cəmiyyətdə tanınan, hörmət edilən şəxs olmuşdur”. Hər il respublikamızın pedaqoji təmayüllü ali və orta ixtisas məktəblərinə tələbə qəbulu planının yüksək səviyyədə yerinə yetirilməsini ilk növbədə bu hörmətin, müəllim peşəsinə olan ehtiramın nəticəsi və göstəricisi kimi qiymətləndirsək də, araşdırmalarımız göstərir ki, bu göstəricilər təkcə bunlarla bağlı deyildir.

Təəssüf hissi ilə deməliyik ki, bu gün pedaqoji peşə sahəsinə, konkret olaraq müəllimliyə üz tutanların, bu sahədə peşə, ixtisas seçənlərin heç də hamısı sevdikləri, bu peşəyə yiyələnmək arzusunda olduqları və daxili tələbatları olduğu üçün onu seçməmişlər. Müşahidələr belə bir fikir söyləməyə əsas verir ki, pedaqoji fəaliyyət zamanı əldə edilən uğurların əsasında müəllimin öz peşəsinə sevgisi, yüksək peşəkarlığı durduğu kimi, müvəffəqiyyətsizliyin əsas səbəblərindən biri və birincisi, bu peşənin təsadüfi seçilməsi, peşə seçiminin düzgün edilməməsidir. Araşdırmalarımız göstərir ki, bu prosesdə elə məqamlar üzə çıxır ki, bunun mənfi nəticələri həm pedaqoji təhsil müəssisələrində, həm də müəllimlərin pedaqoji fəaliyyətində özünü qabarıq şəkildə göstərir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin biologiya fakültəsinin ikinci kurs tələbələri ilə “Mən nə üçün müəllimlik peşəsini seçdim” mövzusunda yazdırdığım inşa yazısı bu baxımdan olduqca səciyyəvidir. Yazıda 32 nəfər iştirak etmişdir. Respondentlərdən cəmi 1 nəfəri orta məktəbdə oxuyarkən müəllim peşəsini seçmək arzusunda olduğunu bildirmiş və ali məktəbə daxil olarkən ərizələrində birinci yerdə məhz bu peşə və ixtisası qeyd etmişlər. Tələbələrin 4 nəfəri başqa peşə seçmək istədiklərini, 19 nəfəri tibb universitetinə hazırlaşdıqlarını, həkim olmağı arzu etdiklərini, lakin imtahan ballarına müvafiq olduğu üçün müəllimlik peşəsini seçdiklərini, 9 nəfəri ali təhsil almaq xatirinə burada oxuduqlarını bildirmişlər. Yazıda iştirak edən tələbələrdən 2 nəfərinin buranı bitirdikdən sonra müəllim işləməyəcəklərini açıq etiraf etmələri təəssüf doğursa da, 6 nəfərin burada oxumalarına peşiman olmadıqlarını və 10 nəfərinin isə burada oxuduqları bir il yarım müddətində onlarda bu sahəyə maraq yarandığı, gələcəkdə yaxşı müəllim kimi  fəaliyyət göstərəcəklərini qeyd etmələri nikbinlik yaradır.

Uzun illər işlədiyim biologiya fakültəsində oxuyan tələbələrin böyük əksəriyyətinin, bəlkə də 90 %-dən çoxunun orta məktəbdə həkim olmağı arzu etdiklərini, məhz tibb universitetini seçmək istədiklərindən məlumatım olduğundan belə bir sorğunu universitetin ibtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin III kurslarında (qrup 301, 302) da apardıq. Lakin burada da alınan cavablar biologiya fakültəsindən bir o qədər fərqli deyildi.

İnşa yazıda iştirak edən 35 nəfər tələbədən yalnız 14 nəfəri hələ orta məktəbdə oxuyarkən müəllim peşəsini seçmək arzusunda olduqlarını bildirmişlər. 21 nəfəri isə başqa peşələrə maraq göstərdiklərini, imtahan ballarının bura müvafiq olduğuna görə seçim etdiklərini yazmışlar. Respondentlərdən 10 nəfəri isə buranı bitirdikdən sonra ixtisasını dəyişmək və başqa peşə sahəsində işləmək arzusunda olduqlarını bildirmişlər. 7 nəfər tələbə isə məhz buradakı təhsil, xüsusən, “Təhsilin əsasları” fənnini öyrəndikdən və pedaqoji təcrübə keçdikdən sonra onlarda bu peşə və ixtisasa maraq yarandığını qeyd etmişlər. Diqqət çəkən bu fakt bir tərəfdən tələbələrdə pedaqoji peşə motivlərinin formalaşmasında pedaqoji–psixoloji fənlərin mühüm təsir imkanlarına malik olduğunu, digər tərəfdən isə bu fənnin digər fakültələrdə də tədrisinə ehtiyac yarandığı fikrini deməyə əsas verir.

Şagirdlər arasında da pedaqoji peşəyə maraq göstərənlər azdır. Ölkəmizdə gedən təhsil islahatları, xüsusən dövlət əhəmiyyəti kəsb edən bir neçə mühüm proqram və konsepsiyalar –“Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyası”, “2011–2021–ci illərdə Azərbaycan təhsilinin inkişafı üzrə Milli strategiya” və “Azərbaycan–2020: Gələcəyə Baxış İnkişaf Konsepsiyası”ndan irəli gələn mühüm vəzifələr yeni pedaqoji təfəkkürə malik olan müəllim-

lərə ehtiyacı artırır. Cəmiyyət sözün geniş mənasında öz işinin əsl ustası olan, peşə, ixtisas və uşaqlara olan sevgini özünün fəaliyyətində birləşdirən, sənətinin vurğunu olan müəllimlərin çiynində dayandığından belə müəllimlərə daha çox ehtiyac hiss olunmaqdadır. Lakin pedaqoji peşə seçən abituriyentlərin heç də hamısının bu sahəyə özünün ürək arzuları, qəlb istəyi ilə gəlməməsi böyük narahatçılıqlar yaradır. Bunu şagirdlərlə də apardığımız sorğuların nəticəsi sübut edir.

Müşahidələr göstərir ki, orta məktəblərdə oxuyan şagirdlər arasında pedaqoji peşəyə maraq göstərənlərin sayı çox deyildir. Bunun əsas səbəblərindən biri məktəblərdə pedaqoji peşəyönümü üzrə işlərin aparılmamasıdır. Bu amillər bir tərəfdən ali məktəblərdə bu sahəni seçmədən oxuyanların sayının artmasına, digər tərəfdən isə orta məktəblərdə kişi müəllimlərin sayının minimuma enməsinə səbəb olduğundan bu sahədə düşünülmüş addımlara ehtiyac vardır. Burada belə bir fakta nəzər yetirmək lazım gəlir ki, bu gün pedaqoji təmayüllü universitet və institutlarda təhsilalanlar arasında bir nəfər də olsun 600 və ondan çox bal toplayaraq tələbə olan yoxdur.

Bakı şəhəri N.Nərimanov rayonundakı 82 nömrəli tam orta məktəbin IX sinfində 21 nəfər şagirdlə "Seçmək istədiyim peşə" mövzusunda apardığım inşa yazı hər iki amili təhlil etmək baxımından olduqca xarakterikdir. Cavabların təhlili göstərir ki, respondentlərdən yalnız bircə nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimi ixtisasını seçmək arzusunda olduğunu bildirmişdir. Öz seçiminin ana dilinə və uşaqlara olan sevgisi və onlarla işləməyə olan həvəsindən irəli gəldiyini əsaslandıran bu şagirddən fərqli olaraq digər şagirdlər hüquqşünas, iqtisadçı, polis işçisi, mühəndis peşələrini seçmək istədiklərini qeyd etmişlər.

Pedaqoji peşənin nüfuzunu və şərəfini qorumaq lazımdır. Pedaqoji peşələrin seçimində bəzən məktəbəqədər yaşlardan – ailədən, bağçadan yaranan motivlər, bəzən də məktəbdə tədris prosesindən, fənlərin və müəllimlərin təsirindən yaranan motivlər özünü göstərir. Belə motivlər şəxsiyyətin sosiallaşmasında, seçilmiş peşənin həyat kredosuna çevrilməsində dominant rol oynayır. Müşahidələr göstərir ki, xüsusən aşağı siniflərdə müəllimin şəxsiyyəti, ümumi və peşə mədəniyyəti, hərəkət və davranışı, şagirdlərə öz övladları kimi yanaşma, münasibətlərindəki səmimilik, istilik, danışıq tərzi, geyimi, səliqəsi və s. şagirdlərə o dərəcədə güclü təsir göstərir ki, bunlar pedaqoji peşə seçiminin motivlərinə çevrilir. Şagirdlər məhz hansısa bir müəlliminə oxşamaq, onun kimi olmaq arzusunda olurlar. Burada müəllim peşəsinin sosial əhəmiyyəti, cəmiyyətdə yeri, şərəfli bir missiyanı yerinə yetirməsi ilə bağlı şifahi şəkildə aparılan işlərlə yanaşı, müəllimin nümunəsi də geniş təsir imkanlarına malik olur. Buna görə də hər bir müəllim müəllim ləyaqətinə, müəllim nüfuzuna xələl gətirə biləcək heç bir sözə, heç bir hərəkətə yol verməməlidir. İxtisasından, hansı sinifdə dərs aparmasından asılı olmayaraq hər bir müəllim pedaqoji peşənin, müəllim sənətinin nüfuzunu, şərəfini qorumaq və yüksəltmək qayğısına qalmalıdır. Bu amillərin pedaqoji peşə marağının formalaşmasında mühüm təsir imkanlarına malik olduğunu unutmamalıdır. Əks halda məktəblərimiz ali məktəbə qəbul olmaq üçün sənəd verən abituriyentlərin ərizələrində 10–15–ci yerlərdə pedaqoji təhsil ocaqlarını qeyd edən gələcək müəllimlərin hesabına komplektləşə bilər ki, bunun da nəticələrini təsəvvür etmək heç də çətin deyildir. Lakin təcrübədə elə mənfi amillərə də rast gəlinir ki, onlar şagirdlərdə pedaqoji peşə maraqlarının yaranmasına olduqca əks təsir göstərir və onlarda bu peşənin sosial əhəmiyyətinin, gərəkliliyinin dərk edilməsinə maneçilik yara-

dır. Hətta bu amillər şagirdlərdə yaranmış maraqların sönməsinə də bilavasitə təsir göstərə bilir. Bunların səbəbkarı isə ilk növbədə müəllimlər özləri olurlar. Belə ki, bəzi müəllimlər şagirdlərin yanında müəllim əməyinin ağırlığından, indiki uşaqlarla işləməyin çətinliyindən, əməkhaqqının azlığından gileylənərək, bəziləri də öz hərəkət və davranışları, müəllim şəxsiyyəti ilə bir araya sığmayan danışıq və davranış tərzi ilə bu peşəni şagirdlərin "gözlərindən salırlar". Onlar unudurlar ki, "Tərbiyəçi şəxsiyyətinin gənc ruha olan təsiri elə bir təsirdir ki, onu nə dərs kitabları, nə nəsihətlərlə, nə də mükafat və cəza sistemi ilə əvəz etmək olar" (K.D.Uşinski).

Orta məktəblərdə kişi müəllimlərinə ehtiyac çoxdur. Bu gün pedaqoji fakültələrdə oxuyan oğlanların sayı çox azdır. Orta məktəblərdə işləyən kişi müəllimlərin sayı isə qadın müəllimlərdən, demək olar ki, 3 dəfə azdır (cəmi 23,7%). Bu da onu göstərir ki, müəllimlik peşəsi üzrə ali təhsil alan gənclərimizin böyük bir hissəsi daha yüksək əməkhaqqı olan əmək və peşə sahəsində çalışırlar. Bəs 4–5 illik dövlət vəsaiti, çəkilən zəhmət? Ən başlıcası orta məktəblərin yalnız qadın müəllimlərdən ibarət olan bir müəssisəyə çevrilməsi. Müəllim peşəsinin az qala qadın sənəti kimi status alması. Hazırda nisbətən zəif nəzərəçarpan, lakin bunun getdikcə dərinləşən və genişlənən mənfi nəticəsini duymaq üçün heç də çox fikirləşmək lazım gəlmir.

Heç kəsə sirr deyildir ki, oğlanlarda mərdlik, qəhrəmanlıq, kişilik, iradə, dözümlülük, cəsarətlilik kimi bir sıra əxlaqi keyfiyyətlərin formalaşmasında atanın və kişi müəllimin rolu əvəzsizdir. Onların şəxsi nümunəsi özü bir məktəbdir. Orta məktəb illəri xarakterin formalaşmasında mühüm bir dövr olduğundan görkəmli rus pedaqoqu K.D.Uşinskinin söylədiyi "Xarakteri xarakter yaradır"– kimi həqiqəti yaddan çıxarmamalıyıq. Aqil atalarımızın dediyi –"Uşaq gördüyünü götürər" fikrini unutmamalıyıq. Lakin müşahidələr göstərir ki, məktəblərimizdə kişi müəllimlərin sayının getdikcə azalması təkcə oğlanların deyil, qızların da tərbiyəsinə mənfi təsir göstərir.

Həqiqətdir ki, bugünkü oğlanlar gələcəyin kişiləri – əsgərləri, Vətən qoruyucuları, ailə başçılarıdır. Onlara kişilik məktəbini keçmələri üçün ailədə ata, məktəbdə kişi müəllimlər lazımdır. Qadın müəllimlərimizin əməyinə, zəhmətinə heç bir kölgə salmadan, fədakarlıqlarını yüksək qiymətləndirməklə yanaşı, məncə onların özləri də razılaşarlar ki, məktəblərimizdə kişi müəllimlərin sayının və nüfuzunun artmasına həqiqətən də böyük ehtiyac vardır.

Müəllimlik peşəsi üzrə peşəyönümü işlərinin gücləndirilməsi günün reallığıdır. Şagirdlərin pedaqoji peşə maraqlarının formalaşdırılmasında məktəbin üzərinə mühüm vəzifələr düşür. Bunlardan biri şagirdlərdə müəyyən olunmuş aparıcı peşə motivləri ilə gələcək fəaliyyət məqsədlərinin bir – biri ilə uyğunluq səviyyələrinin aşkara çıxarılmasıdır. Hər bir məktəb psixoloqu, sinif rəhbəri, fənn müəllimləri bunu nəzərə alaraq müşahidə, müxtəlif sorğular, testlər vasitəsilə pedaqoji sahəyə maraq və qabiliyyəti olan şagirdləri müəyyənləşdirməli, bu şagirdlərin gələcək fəaliyyət məqsədlərinin nələrdən ibarət olduğunu aydınlaşdırmalıdırlar. Bundan sonra aparıcı peşə motivləri ilə onların nə səviyyədə uyğun olub–olmadığını müəyyənləşdirməli, son nəticədə bu uyğunluğa nail olmağa çalışmalıdırlar. Təlim və dərsdənkənar məşğələlər bu prosesdə geniş imkanlara malik olduğundan bunların üzə çıxarılması və reallaşdırılması mühüm əhəmiyyət kəsb edir. Pedaqojiyönümlü dərnək məşğələləri, klublar təşkil etmək, şagirdləri maraqlı pedaqoji situasiyalarla qarşılaşdırmaq, "Əməkdar müəllim"lərlə, "İlin müəllimləri" ilə, qabaqcıl elm xadimləri və ali

məktəb müəllimləri ilə görüşlər təşkil etmək, kiçikyaşlı şagirdlərlə işləməyə istiqamətləndirmək kimi tədbirlərdən istifadə etmək bu cəhətdən olduqca faydalıdır. Uzun illər bizim universitetimizdə ənənəyə çevrilən, lakin sonradan unudulan bir məsələnin – pedaqoji ali məktəblərin orta məktəblərlə əlaqəsinin gücləndirilməsinə, bu sahədə ali məktəbin fəaliyyətinin artırılmasına da zərurət vardır. Belə əlaqələr şagirdlərin pedaqoji peşələrə maraqlarının artması ilə yanaşı, onlarda müəllimlik peşəsinin mahiyyətinin düzgün dərk edilməsinə də əsaslı təsir göstərər.

Məktəblərimizdə güclü müəllimlər görmək istəyiriksə məktəb ən savadlı, ən ümidverici şagirdlərini məhz müəllim peşəsi seçməyə yönəltməlidir. Buna görə də orta və ali məktəblər müəllim hazırlığına maraqlı olmalı, pedaqoji peşəyönümlü işləri məktəbin təlim–tərbiyə işlərinin tərkib hissəsinə çevrilməlidir. Gələcəyin əsl müəllimlərini məhz orta məktəb partası arxasında əyləşən şagirdlərin arasından seçmək lazımdır. Hər bir yaxşı müəllim öz əvəzedicisini hazırlamalıdır. Pedaqoji ali və orta ixtisas məktəblərində isə tələbələrin müəllim peşəsinə maraq və motivlərinin dərinləşməsinə və seçdikləri peşə və ixtisasa bağlanmalarına xüsusi diqqət yetirilməlidir. Həmçinin pedaqoji sahə üzrə qəbul imtahanlarında qabiliyyət imtahanlarının olmasını zəruri hesab edirik. Bu, yalnız ali təhsil almaq xatirinə pedaqoji ali məktəblərə daxil olanların qarşısını almaqla yanaşı, heç də bundan az zərərli olmayan bir nöqsanın – müəllimlik peşəsinə psixofizioloji cəhətdən yararlı olmayan şəxslərin daxil olmasının da qarşısını ala biləcəkdir. Nəticədə məktəblərimiz daha səriştəli, öz peşəsini sevən əsl müəllimlərlə komplektləşə bilər ki, bunun da faydasını bütün cəmiyyətimiz görmüş olar.

*Rəyçi: prof. Ə.Ağayev*

**М.Ильясов**

**Проблема выбора в подготовке учителя**

**Резюме**

В последние годы отношение к избравшим профессию учителя, являющейся священной, почетной и нужной, не совсем вызывает оптимизма.

Проявляющих интерес к педагогической профессии среди учеников также мало. Недостаток среди мальчиков, желающих идти в преподаватели, особенно увеличил востребованность учителей мужского пола. Нужно поднять престиж и почетность педагогической профессии. Усиление работ в направлении учительской профессии должно найти свое разрешение как актуальная проблема дня.

**M.Ilyasov**

**The problem of choice in teacher preparation**

**Summary**

The author regards teaching as holy, honourable and necessary profession. The society is strong when it has a good education and competent teachers. But in our society there isn't any interest to this profession. Especially boys aren't interested in this profession. Most of them are interested in technical professions, therefore pedagogical colleges; especially technical colleges must be developed.

# ATALAR SÖZLƏRİ: HİKMƏT VƏ ÖYÜDLƏR

**İsmayıl Əliyev**
***Naxçıvan Özəl Universitetinin rektoru, pedaqogika üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *milli-mənəvi dəyərlər, atalar sözləri, etnopedaqogika, öyüd.*
***Ключевые слова:*** *национально-духовные ценности, пословицы, этнопедагогика, наставление.*
***Key words:*** *national and moral virtues, proverbs, ethno-pedagogy, edification.*

Ali məktəbdə “Pedaqogika” kursunun tədrisi zamanı “Təhsilin məzmunu” adlı mühazirəni bu cür başlamağın səmərəsini dəfələrlə görmüşəm:

“ – Biz, ümumiyyətlə, nə bilirik? – Nə öyrənmişik, onu!

– Nə öyrənmişik? – Nə öyrədiblər, onu!

– Nə öyrədiblər? – Nə istəyiblər, onu!

– Nə istəyiblər? – Nə öz mənafelərinə uyğundur, onu!

– Deməli, təhsilin milli inkişaf amili olması üçün öyrədənlə öyrənənin mənafeləri üst-üstə düşməlidir. Deməli, təhsilin xəlqi, milli mahiyyət daşıması üçün dövlətin mənafeyi bütövlükdə, xalqın, onun hər bir üzvünün mənafeyi ilə eyni olmalıdır. Məhz bu halda aşağıdakı düstur zəruridir:

Təhsilin məzmunu son nəticə olaraq, bu sualların cavabını təhsilalanlar üçün tam təmin etməlidir:

– biz kimik?

– nəyimiz olub, nəyimiz var, bizdən sonra nə qalacaq?

– biz bu həyatdan nə istəyirik?

– məqsədimizə çatmaq üçün nə öyrənməliyik?”

Mənim fikrimcə, cəmiyyətin, xalqın, millətin mövcudluğu və inkişafı üçün həll edilməli olan bütün məsələlər bu dörd zəruri sualdan sonrakı yerlərdə durur. Heç bir xalq haqq etdiyi şeylərə yiyələnmədən, sahib olduğu şeyləri dəyərləndirmədən, onları qoruyub, gələcək nəslə tapşırmadan nəinki inkişaf edə bilməz, hətta öz mövcudluğunu qoruyub saxlaya bilməz.

Xalqın malik olduğu ən zəngin sərvət onun milli-mənəvi dəyərləridir. Milli-mənəvi dəyərlərin yaradıcısı, daşıyıcısı və qoruyucusu xalqdır. Bütün xalqların mədəni tarixində bu möhtəşəm funksiyalar uzun əsrlər boyu şifahi xalq yaradıcılığı vasitəsilə həyata keçirilmişdir.

Mədəni inkişafın müəyyən mərhələsindən sonra xalq yaradıcılığından praktik istifadə ilə yanaşı, elmi araşdırmalar vasitəsilə onun nəzəri məsələləri də öyrənilməyə və sistemləşdirilməyə başlandı. Şifahi xalq yaradıcılığını tədqiq edən ana elm folklorşünaslıqdır. Bununla yanaşı, öz tədqiqat predmetləri baxımından bu zəngin xəzinəyə müraciət edən çoxsaylı elmlər də vardır.

Belə elmlərdən biri də etnopedaqogikadır. Etnopedaqogikanın xalq yaradıcılığına münasibətinin xarakteri digər elmlərdə olduğundan fərqli xüsusiyyətlər daşıyır. Bütün digər elmlər, hətta folklorşünaslıq da, şifahi xalq yaradıcılığı nümunələrinin toplanması, bədii, estetik, etnoqrafik, tarixi, iqtisadi, dilçilik, xalqın psixologiyası, təfəkkür tərzi və s. baxımından dəyərli olan məsələlərin tədqiqi ilə məşğul olur.

Etnopedaqogika isə bu materialların tərbiyəvi imkanlarını, böyüyən nəslin layiqli vətəndaşlar kimi formalaşmasında onlardan istifadənin əhəmiyyətini, bu zəngin mənəvi xəzinənin gənc nəslin “qanına və canına”, ruhuna hopdurulması və beləliklə, həm də onların qorunub saxlanılması yollarını öyrənir.

Başqa sözlə deyilsə, bizim fikrimizcə, xalqın yaratdığı çoxsahəli milli-mənəvi dəyərlərin əsl mahiyyətinin, əhəmiyyətinin aşkarlanmasında etnopedaqoji tədqiqlərin xüsusi rolu vardır.

Bir az əvvəl dedik ki, milli-mənəvi dəyərlərin və o cümlədən şifahi xalq yaradıcılığı nümunələrinin yaradıcısı, daşıyıcısı və qoruyucusu xalqdır. Bu üç funksiyadan ikisi – daşıyıcılıq və qoruyuculuq funksiyası öyrətmə, tərbiyə etmə ilə bağlı olduğundan bilavasitə etnopedaqogikanın tədqiqat sahəsinə aiddir. Digər bir tərəfdən, bu üç funksiya arasında əlaqənin möhkəmlənməsi vəzifəsi də etnopedaqogikanın üzərinə düşməlidir. Məsələni bir az aydın şərh edək: İlk baxışda, göstərilən funksiyalar arasında asılılıq bu cürdür: şifahi xalq nümunələri yaranır, xalq arasında ağızdan-ağıza keçərək formalaşır, bilavasitə praktik həyatda istifadə edilərək böyüyən nəsil tərəfindən mənimsənilir və beləliklə də qorunub saxlanılır.

Şifahi xalq yaradıcılığı nümunələri yaranmasının şərti olaraq qəbul etdiyimiz bu prosesinin çox mühüm mərhələsi “bilavasitə praktik həyatda istifadə edilərək, böyüyən nəsil tərəfindən mənimsənilməsi”dir. Yəni xalq yaradıcılığı nümunələrinin qorunub saxlanması, inkişaf etdirilməsi, əslində, onların gənc nəslə necə çatdırılmasından, onun əsl mahiyyətinin necə mənimsənilməsindən asılıdır.

Fikrimizi ümumiləşdirərək demək istəyirik ki, gənc nəslin milli-mənəvi dəyərlərə sahib çıxmaq, onları qoruyub, inkişaf etdirmək ruhunda tərbiyə edilməsində etnopedaqogikanın əvəzedilməz imkanları vardır. Xalq yaradıcılığının elə bir sahəsi yoxdur ki, gələcək nəsillər üçün tərbiyəvi əhəmiyyət daşımasın. Yuxarıda şərti olaraq təhsilin məzmununa aid etdiyimiz hər bir sualın cavabını da etnopedaqoji materiallarda daha dəqiq tapmaq olar.

Bundan ötrü isə bu materiallar ətraflı tədqiq olunmalıdır.

Tədqiqinə ehtiyac duyulan etnopedaqoji materiallardan ən mühümi, fikrimizcə, atalar sözləridir.

Əcdadların gələcək nəsillərə ən böyük mənəvi yadigarları atalar sözlərində toplanmışdır. Xalqın həyat fəlsəfəsinin dərinliyini qeyri-adi bir tamlıqla ifadə edən atalar sözlərini Şərqdə “dilin gülzarı”, “ipə-sapa düzülməmiş incilər”, yunanlar və romalılar “hakim fikirlər”, ruslar “ibrətamiz, qanadlı ifadələr”, italyanlar “xalq məktəbi”, ispanlar “ruhun təbiəti” adlandırırlar. Türk xalqlarının möhtəşəm abidələrindən olan “Oğuznamə”yə yazdığı ön sözdə professor Samət Əlizadə atalar sözləri haqda deyir:

“Bu, əsl möcüzədir ki, “ata-anasız” doğulan hər bir paremik vahid uzun məsafələr, dolanbac yollar keçib, əcdadımızın canlı səsini, nəfəsini, gah nikbin, gah da bədbin əhvali-ruhiyyəsini, təcrübədən çıxmış öyüd-nəsihətini, müzəffər dərrakəsini tarixin qaranlıq girdabından çıxarıb bizə çatdırır” (1, 10).

Atalar sözləri özündə keçmişi ehtiva etməklə məhdudlaşmır; o, həm də xalqın bugünkü canlı səsi, çağırışıdır. Xalq bu gün zəruri, sabah isə gərəkli olanı qoruyub saxlayır. Keçmişdə olanları əhatə etsə də, atalar sözləri bu günün və gələcəyin tələbləri baxımından əhəmiyyətlidir. Xalq atalar sözlərində ifadə olunmuş həqiqəti bugünkü idealına nə dərəcədə uyğun gəlib-gəlməməsi baxımından qiymətləndirir.

Atalar sözləri hər bir xalqın əcdadının, ulu babalarının, atalarının bugünkü nüma-

yəndəsinə və gələcək xələflərinə ünvanlanmış səsidir. Ümumiləşdirmə gücünə, yığcamlığına və obrazlı ifadə tərzinə, fikir tutumu, bədiyyatı və fəlsəfi dərinliyinə görə bir müdriklik xəzinəsi olan, neçə-neçə qərinələr aşıb-adlayaraq günümüzə qədər qorunub saxlanılan və "din-iman qədər əziz tutulan bu milli təfəkkür inciləri məhz müqəddəs bilinib tapınılan ulu əcdadların ruhuna ehtiram əlaməti olaraq da "atalar sözləri" adı ilə adlandırılmışdır".

Təəssüf ki, ölkəmizdə atalar sözləri öz layiqli tədqiqini tapmamışdır. Ən yaxşı halda, bu hikmətlərin toplanması sahəsində müəyyən işlər görüldüyünü qeyd etmək olar. Bir az da, osmanlı türkləri demişkən, üzülərək qeyd etmək istəyirəm ki, atalar sözlərinin toplanması və toplu halda nəşrləri də çox qüsurludur. Professor S.Xəlilovun haqlı olaraq dediyi kimi: "Atalar sözlərini yığıb təsnif etmək, qruplaşdımaq ilk baxışda sadə görünsə də, olduqca böyük mənəvi məsuliyyət tələb edir. Təəssüf ki, ölkəmizdə "atalar sözləri" adı ilə çap edilmiş əsərlərə, haradan nə tapılıbsa, ağına-bozuna baxmadan əslində nəinki "atalara", heç oğul-uşağa da rəva bilinməyən sözlər hamısı daxil edilir (2).

Fikrimizcə, Azərbaycan atalar sözləri fəlsəfə, sosiologiya, dilçilik, ədəbiyyatşünaslıq, tarix, etnoqrafiya, psixologiya elmlərinin obyekti kimi, hələlik, öz layiqli tədqiqini gözləməkdədir. Halbuki, qardaş Türkiyədə bu sahədə çox geniş tədqiqatlar aparılmış və bu iş indi də davam edir.

Atalar sözlərini əsl dəyərlərinə layiq tədqiq etməməyimiz bir sıra fəsadlara səbəb olur:

1. Atalar sözlərinin bir qismi unudulur.

Söhbət cəmiyyətin inkişafı ilə dildəki müəyyən sözlərin, dil vahidlərinin canlı danışıq dilində az işlənməsi və ya arxaikləşməsindən getmir. İstər canlı danışıq, istər ədəbi, hətta elmi, siyasi, diplomatik dildə atalar sözlərindən istifadə nitqin səviyyəsini yüksəldir, fikrin sərrastlığını təmin təmin edir. Onsuz da az oxunan bədii əsərlərimiz istisna olmaqla, kütləvi informasiya vasitələrində, təhsil müəssisələrində, diskussiyalarda, müsahibələrdə atalar sözlərindən istifadənin xüsusi çəkisi aşağı düşməkdə, azalmaqdadır. Bu, bir həqiqətdir ki, hikmətli sözlərsiz, aforizmlərsiz, atalar sözlərsiz nitq ya qabalaşır, ya da yadlaşır, özgələşir.

Dərs dediyim ali məktəbin 70 tələbədən ibarət bir birləşməsinə şifahi olaraq 20 atalar sözünü tamamlamalarını tapşırmışdım. Yalnız 9 atalar sözünü tamamlamaq mümkün oldu. Milli-mənəvi dəyərlərə bu şəkildə biganəlik yol verilməzdir.

2. "Atalar sözü" adı altında, əslində atalar sözü olamayan çoxlu sayda ifadələr toplanır. "Atalar sözü" adlı akademik nəşrdə, professor S.Xəlilovun dediyi kimi, "heç oğul-uşağa da rəva bilinmyən sözlər"in atalar sözləri kimi təqdim edilməsi bir yana, lətifələr, məsəllər, qaravəllilər... də atalar sözləri kimi təsnif edilir (3). "Atalar sözləri" məfhumu "ataların sözləri", yaxud "ataların dedikləri" kimi başa düşülməməlidir.

3. Atalar sözlərinin mahiyyəti tam dərk olunmadığından, necə deyərlər, "külüngünü qapan onların üstünə cumur".

Məsələn, tədqiqatların bir çoxunda atalar sözlərindən bəzilərinin ziddiyyətli olması, həqiqəti əks etdirməməsi, "yanlış düşüncənin məhsulu olması" haqda fikirlərə rast gəlinir. Nümunə kimi "Yoxdan Allah da bezardır", "Allahsız yerdə otur, ağsaqqalsız yerdə oturma" kimi atalar sözlərini nəzərdən keçirək. Doğrudan da ilk baxışda həmin atalar sözləri "Allah" (c.c.) hər şeyə qadirdir və "Allahsız məkan yoxdur, Allah (c.c) insan ağlının dərk etdiyi və etmədiyi hər yerdədir, O məkansızdır" ehkamlarına ziddir.

Həmin atalar sözlərinə onların ifadə etdiyi hikmət və daşıdığı öyüd baxımından yanaşdıqda isə hər şey aydın olur.

Məlumdur ki, atalar sözlərinin bir

xüsusiyyəti də söylənilən fikri məcaz vasitəsilə anlatmaqdır. "Yoxdan Allah da bezardır" atalar sözündə də məcaz hakimdir. Buradakı əsas mahiyyətə empirik yanaşma düzgün deyildir. "Yoxdan Allah da bezardır" deməklə yoxluğun, əslində, çox böyük bəla olduğuna işarə edilir. "Yox" dedikdə, ancaq maddi şey, yaxud var-dövlət başa düşülməməlidir. Bütün çatışmazlıqlar "yox" səviyyəsində ola bilər. Və bu "yox" o zaman əsl mahiyyətini alır ki, insan mümkün olan bütün imkan və vasitələrə əl atır, çarə tapa bilmədikdə "yox"la barışmalı olur. Atalar sözünün əsas mahiyyəti də bu zaman aydın olur: deməli, həllinə çarə olmayan "yox"la barışmaq lazımdır, ona çox üzülməməlisən, səbr etməlisən, ahu-zar edib daha ağır ruhi sarsıntılara düçar olmamalısan.

Yaxud "Allahsız yerdə otur, ağsaqqalsız yerdə oturma" atalar sözündə söhbət Allahın (c.c) olmadığı yerdən getmir. Onu qəbul etməyən, Onun vəhdaniyyətinə inanmayan insanlarn toplaşdığı yerdən gedir. Belə insanlar Həzrəti Peyğəmbərin (s.ə.s) zamanında da olub, indi də vardır.

Atalar sözünün öyüd mahiyyəti isə belədir: "Allahsız (Allahı tanımayan) adamların toplaşdığı yerdə bəlkə də xata-bəlasız ötüşmək olar, amma ağsaqqalı olmayan cəmiyyətdən nə desən gözləmək olar. Onlardan uzaq durmaq yaxşıdır".

4. Adətən, atalar sözləri ədəbiyyatçılar, folklorşünaslar tərəfindən daha çox öyrənilir. Amma onları yalnız epik təfəkkürün məhsulu hesab etdikdə əsl mahiyyətləri, məqsədləri kölgədə qalır.

Atalar sözlərini deyimlərdən, aforizmlərdən, məsəllərdən fərqləndirən əsas xüsusiyyət onlarda həm hökm, həm də öyüdün olmasıdır. Buradakı hökmlər heç bir etiraz, şübhə, dəqiqləşdirmə qəbul etmir. Onlardakı öyüd dəfələrlə sınaqdan çıxmış həyati təcrübələrin sözlərdə qəlibləşmiş ifadələri olduğundan yerinə yetirilməsi zəruri olan əxlaqi mahiyyət daşıyır. Atalar sözlərinin fəlsəfi və pedaqoji baxımdan incələnməsi belə bir qənaəti təsdiq edir ki, əslində onlardakı hökm öyüdün-əxlaqi davranışın, tərbiyəvi – didaktik mahiyyətin zəruriliyini təmin edir. Hökm atalar sözlərindəki fikrin real mahiyyətini, öyüd isə məcazi mahiyyətini əks etdirir.

Buradan çıxış edərək atalar sözünə belə bir tərif vermək olar: xalqın uzunmüddətli təcrübələri əsasında formalaşan hökmlərin, həyati həqiqətlərin, öyüd məqsədilə daha çox məcazi yolla bugünkü nəslə çatdırılmasına xidmət edən "qəlibləşmiş" ifadələrə atalar sözləri deyilir.

Tərifə əsasən də atalar sözlərinin mühüm əlamətlərini müəyyən etmək olar:

– atalar sözləri bir faktın və ya hadisənin, olayın uzunmüddətli müşahidə, tətbiq və sınaqdan keçərək, buradakı həqiqətin hökm şəklində formalaşdırıldığı paremilərdir. Məs.: "Çıraq öz dibinə işıq salmaz", "Balıq başdan iylənər", "Yetim quzudan qoç olmaz"...

– atalar sözləri "qəlibləşmiş" ifadələrdir. Buraya hər hansı söz əlavə etmək, çıxmaq və ya sözlərin sırasını dəyişmək olmaz. Məs.: "Yüz ölç, bir biç", "Palaza bürün, elnən sürün", "Arxalı köpək qurd basar". Bu atalar sözlərində "Bir biç, yüz ölç", yaxud "bir ölç, yüz biç"demək anlamsız bir ifadə yaradardı;

– atalar sözlərində bəşəri anlam üstünlük təşkil edir. Eyni atalar sözünün qarşılığını, demək olar ki, əksər dünya xalqlarının yaradıcılığında tapmaq mümkündür. Buna baxmayaraq, tədqiqatlar göstərir ki, hər bir xalqın həyatının daha çox bağlı olduğu kultlara dair xalq yaradıcılığı nümunələri, o cümlədən də atalar sözləri digər xalqlarda olduğundan daha çox olur.

– atalar sözləri həyati həqiqətləri əks etdirdiyindən onlardakı hökmlərin doğruluğu heç kimdə şübhə doğurmur. Məs.: "Ağac

yaşkən əyilər". Amma atalar sözlərinin əsas mahiyyətini, əsl dəyərini müəyyən edən öyüdün keyfiyyəti isə ilk baxışda aydın olmaya bilir. Məs. "Sürü geri dönəndə axsaq qabağa düşər" atalar sözündəki öyüd anlamı, mütləq, dərin düşüncə, iti təfəkkür tələb edir. Atalar sözlərinin etnopedaqoji təhlili zərurəti də məhz buradan doğur ki, bu haqda, inşallah, gələcək yazılarda bəhs etmək fikrindəyik.

– atalar sözləri şifahi xalq yaradıcılığının digər bir çox növləri kimi istənilən vaxt dilə gətirilən, söylənilən sərbəst məqamlı ifadələr deyildir. Ondan əksər hallarda müəyyən hadisənin, işin, olayın dəfələrlə icrası nəticəsində yəqinləşmiş qənaəti, oxşar halın baş verməsi gözlənildikdə, duyulduqda öyüd verilən adama çatdırmaq üçün istifadə olunduqda daha əhəmiyyətli olur.

– atalar sözlərinin bir çoxunda öyüd vermək üçün məcazlardan istifadə olunur.

Məcaz – bir-birindən fərqli əşya və hadisələr arasında qarşılaşdırma apararaq onların bənzərliyini anlatmaq üçün əsl məqsədi, mahiyyəti dolayısı ilə bildirməkdən ötrü istifadə edilən söz və ya ifadədir. Məcazlar nitqə, söylənilən fikrə canlılıq və hərəkət qazandıran ünsürlərdir.

Atalar sözləri də daha çox məcazlar üzərində qurulan qəlibləşmiş xalq ifadələri olduğundan, onlarda söylənilənin əslində digər məqsədin metaforik ifadəsi olduğu dərk olunmalıdır.

Məsələn: "Yetim quzudan qoç olmaz".

Mənbə

Yetim quzu

Məcazi məqsəd

Məhrumiyyətlərlə böyümüş, zəif nəcabətli adam.

Mənbə

Qoç

Məcazi məqsəd

Başçı, lider, rəhbər olacaq, güvəniləcək adam

Ontoloji və epistemik uyğunluqlar:

– Anası ölən quzuya yetim quzu deyirlər. Onu əmizdirmək üçün sürüyə qatanda heç bir qoyun onu qəbul eləmir, ayaqları ilə, buynuzları ilə döyür, qovalayırlar. Quzu "süddən yanır". Bəzən çobanlar həmin quzunu "ağzı ota çatanacan" süni yolla əmizdirirlər. Uzun illərin təcrübəsi göstərir ki, ana nəvazişi görməyən həmin quzu böyüdükdə sürü içərisində qoç ola bilmir. Başqa sözlə, sürüdəki digər qoçlarla "qoç döyüşünə" davam gətirməyib, lider ola bilmir.

Digər bir tərəfdən, yaxşı bəslənilmiş əsl qoç həndəvərinə digər qoçları buraxmır, bəzən yad adamların və ya qorxulu heyvanların sürüyə yaxınlaşmasından narahatçılığını bildirir, bir növ çobanı xəbərdar edir.

Ona görə də çobanlar heyvanların sayını artırmaq üçün qoç seçəndə "yetim quzu"nun üzərində dayanmırlar. Yəni çobanlar bilirlər ki, qoçu yetimlik görmüş sürüdə döl yaxşı olmaz.

Beləliklə, sürünü sağlam, artımlı görmək istəyirsənsə, yetim quzunu qoçluğa saxlamamalısan. Onsuz da ondan qoç olmaz.

– Atalar böyük ustalıqla şəxsiyyət formalaşması üçün zəruri amillərin rolunu görmüşlər. "Yetim quzudan qoç olmaz" atalar sözü daha çox əsl-nəcabəti olmayan, yaxşı tərbiyə görməmiş adamların dəyərləndirilməsi zamanı işlədilir. Yaxud müəyyən imkanlara malik vəzifəyə, məqama təsadüfən yiyələnmiş, ətrafsız, dayaqsız adamlar haqda bu ifadə işlədilir.

Atalar övladlarına öyrətmək istəmişlər ki, müəyyən bir işdə güvənilən tərəfdaş, ortaq seçmək lazım gələrsə, mütləq, onun əsl-nəcabəti, böyüdüyü mühit, aldığı tərbiyə nəzərə alınmalıdır. Çünki böyüyənə qədər gördüyü sıxıntı, çəkdiyi əzablar, üzləşdiyi məhrumiyyətlər əksər adamların xarakterində öz əksini tapır. Ata qüdrəti, ana doğmalığı, bacı mehribanlığı, qardaş dayağı görməyən adama tam etibar etmək olmaz.

Beləliklə, milli-mənəvi dəyərlərin öyrənilməsi, onlara sahib çıxılması, bu "hikmət və öyüd çeşməsinin" qorunub saxlanılması və gənc nəslə çatdırılması sahəsində etnopedaqoji tədqiqatlar zəruridir və bu tədqiqatlar zamanı aşağıdakılar əsas götürülməlidir:

– əsl atalar sözləri ciddi, nüfuzlu, təmkinli, müdrik ataların məhz tərbiyə məqsədilə, övladlarına, böyüyən nəslə, həyati təcrübəsi az olanlara öyüdləridir;

– atalar sözlərinin əsasında real həyat həqiqətləri durur;

– atalar sözlərinin əsas məqsədi insanlara real gerçəkliyi dərk etmək və beləliklə, ləyaqətli həyatı təmin etməyi öyrətməkdir;

– xalqın qoruyub saxladığı bütün atalar sözləri onun yaşam tərzinin, milli mənəviyyatının güzgüsüdür.

*Rəyçi: prof. M.Allahmanlı*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əlizadə S. Müdrikliyin sönməz işığı //Oğuznamə. Bakı, 1987.

2. Xəlilov S. Dilin hikmət potensialı. Ədəbiyyat, 5 may, 2012-ci il.

3. Atalar sözü // (Toplayanı Ə.Hüseynzadə). Bakı, 1981.

4. İ. Kurt. Türk atasözlərinə psikolojik bir yaklaşım. Ankara, 1991.

5. Türk Atasözləri və deyimləri. I, II c. İstanbul, 2001.

6. Özən Yaylagül. "Divani Lüğat-it Türk" də yer alan atasözlərindəki metaforalar. //www.millifolklor.com.

**И.Алиев**

**Пословицы: мудростъ и наставления**

**Резюме**

В статъе отмечается необходимостъ всестороннего исследования пословиц как националъно-духовную ценностъ, перечисляются особенности пословиц как этнопедагогический материал, обосновывается значение пословиц в воспитании молодого поколения.

**I.Aliyev**

**Proverbs: wisdom and edification**

**Summary**

In this article it is dealt with the importance of proverbs as national moral virtues. The author investigates proverbs from ethno pedagogical point of view and regards them as significant tools in educating young generation.

# PEDAQOJİ İRSİMİZ TƏDQİQ EDİLİR

**Yaqub Babayev**
***filologiya üzrə elmlər doktoru***

Azərbaycan xalqının pedaqoji fikir xəzinəsi qədim tarixə, zəngin ənənəyə, tutumlu mahiyyətə malikdir. Onun zamanın qoruyub bizə saxladığı hər bir nümunəsini öyrənmək, bu pedaqoji sərvəti yaradanların irsini araşdırıb elmi və kütləvi şəkildə ictimaiyyətə təqdim etmək istər bugünkü, istərsə də gələcək tədqiqatçıların vətəndaşlıq borcudur. Bu mənada pedaqoq alimlərimizdən prof. Fərrux Rüstəmov və prof. İramin İsayevin "Pedaqoji irsimizdən: M.V.Vidadi, M.P.Vaqif, Q.Zakir" kitabı (Bakı: Elm və təhsil, 2013) diqqətəlayiqdir. Qeyd etmək lazımdır ki, hər iki tədqiqatçı respublikamızın tanınmış, nüfuzlu və məhsuldar alimlərindəndirlər. Pedaqogika elmimizin inkişafı sahəsində onların kifayət qədər xidmətləri vardır. Pedaqoji fikir tariximizin istər ayrı-ayrı şəxsiyyətlərinin, istərsə də müxtəlif pedaqoji problemlərin araşdırılmasında hər iki alimin zəhməti danılmazdır.

Yeri gəlmişkən onu da əlavə edək ki, haqqında söz açdığımız bu elm adamları həm də pedaqoji fəaliyyətlə, müəllimlik peşəsi ilə məşğuldurlar. Başqa sözlə, bu araşdırma təsdiq edir ki, burada tədqiqatçı səriştəsi ilə müəllimlik bacarığı birləşmiş və bir-birini tamamlamışdır.

Ötən il prof. F.Rüstəmov və prof. İ.İsayev tərəfindən yeni bir sanballı elmi fakt ortalığa qoyulmuş və klassiklərimizin yaradıcılığı ilə yanaşı pedaqoji fikir xəzinəmizə müraciət edilmişdir. Müəlliflərin 2013-cü ildə "Elm və təhsil" nəşriyyatı tərəfindən çap olunmuş bu kitabının, elmi redaktoru akademik Hüseyn Əhmədov, rəyçiləri isə mərhum prof. Əmrulla Paşayev, prof. Ağahüseyn Həsənov və dos. Həsən Bayramovdur.

Monoqrafiyada M.V.Vidadi, M.P.Vaqif və Q.Zakir kimi görkəmli sənətkarların həyat və yaradıcılığı nəzərdən keçirilir. Lakin bizim görkəmli şair, poeziya xadimi, ədəbi şəxsiyyət kimi tanıyıb qəbul etdiyimiz bu sənətkarların yaradıcılığına F.Rüstəmov və İ.İsayev bu dəfə bizim adət etdiyimiz rakusdan deyil, tamamilə başqa bir yöndən nəzər salırlar. Başqa sözlə desək, biz M.V.Vidadi, M.P.Vaqif və Q.Zakiri bir şair kimi tanıdığımızdan onlara bir filoloq nöqteyi-nəzərindən yanaşmağa alışmışıq. Bizim adət etdiyimiz fikrə görə, adını çəkdiyimiz ədəbi simaların əsərləri ya bir ədəbiyyatşünas, ya da dilçi kimi analizdən keçirilir. Lakin F.Rüstəmov və İ.İsayev mötəbər dəlillərlə sübut edirlər ki, bu böyük sənətkarların irsinə həm də bir pedaqoq kimi yanaşmaq lazım gəlir. Yəni həmin şairlərin ədəbi mirası yalnız poetik sərvət deyil, həm də zəngin çalarları, dərin məzmun və mahiyyəti ilə fərqlənən pedaqoji xəzinə, tərbiyə vasitəsidir. Burada hətta təlim və təhsilə aid maraqlı, gərəkli fikirlər nəzəri cəlb edir.

Beləliklə, bu dəfə M.V.Vidadi, M.P.Vaqif və Q.Zakirin əsərlərinə filoloq baxışı ilə deyil, pedaqoq alimlərin münasibəti ilə tanış oluruq. Bu əsərlər ədəbiyyatşünas və dilçi fəhminin yox, pedaqoq təfəkkürünün təhsil süzgəcindən keçir. Adını çəkdiyimiz şairlərin mənəvi mirası bədii sərvət olmaq missiyasını pedaqoji irs olmaq stixiyası ilə əvəz edir. Bizim pedaqoq alimlərimiz həmin stixiyanı elmi-pedaqoji fikirə çevirə bilmişlər. Əsas məsələ belədir: M.V.Vidadi, M.P.Vaqif və Q.Zakirin əsərlərinə bədii, yoxsa pedaqoji fakt kimi baxılmalıdır? Axı,

bu əsərlərə pedaqoji fakt kimi baxmaqdan ötrü pedaqoqlarımız bizi öz arqumentləri ilə inandırmalı, monoqrafiyanın adı kimi müəyyənləşdirdikləri "pedaqoji irsimizdən" hökmünü sübut etməli idilər.

Ədalətlə demək mümkündür ki, monoqrafiyada verilən bu hökm, nəzərdə tutulan qayə kifayət qədər əsaslandırılmış fakt və təhlillərlə təsbit edilmişdir. Seçilən nümunələr, aparılan analizlər, söylənən fikirlər və ümumiyyətlə, baxış tərzi bütövlükdə bu qənaətə gəlməyə imkan verir. Monoqrafiyanı diqqətlə oxuyub onun əsas mahiyyəti ilə tanış olduqdan sonra annotasiyada deyilən belə bir fikrin həqiqət olduğuna inanırıq: "Kitabda Azərbaycan ədəbi-bədii və pedaqoji fikir tarixində görkəmli yer tutan M.V.Vidadi, M.P.Vaqif və Q.Zakirin pedaqoji fikirləri tədqiq edilir, onların gənc nəslin əxlaqi-mənəvi tərbiyəsində, şəxsiyyət kimi formalaşmasında bu gün də əhəmiyyətini itirməyən, aktuallığı ilə seçilən ədəbi-bədii əsərlərinin pedaqoji siqləti aşkarlanır".

Doğrudur, müəlliflər kitabın tələbələr və tədqiqatçılardan ötrü nəzərdə tutulduğunu qeyd edirlər. Fikrimizcə, kitab daha geniş oxucu auditoriyası üçün faydalıdır. Ondan geniş oxucu kütləsi də yararlana bilər. Ədəbiyyat müəllimlərimiz daha çox faydalanarlar. Çünki burada deyilən fikirlər, irəli sürülən mülahizələr, aparılan təhlillər elmi əsaslandırmalarla yanaşı, həm də sadə, aydın və hər kəs üçün dərkolunan səviyyədə şərh edilmişdir.

Müəlliflər kitaba dəyərli ön söz də yazmışlar. Ön sözdə türk dünyasının ünlü sənətkarlarından Qafur Qulamın qələminə məxsus belə bir şeirin epiqraf kimi verilməsi kitabın ideya yükünün və əsas məndəricəsinin bədii sözlə ifadəsi məqamındadır:

Keçmişi öyrənirsən,
Öyrənişin mübarək.
Keçmişdən dərs almasa,
İşıqlanmaz gələcək.

Diqqəti cəlb edən əsas cəhət bir odur ki, prof. F.Rüstəmov və prof. İ.İsayev tədqiqat obyekti kimi götürdükləri hər üç sənətkarın yaradıcılığına kifayət qədər dərindən nüfuz edə bilmiş, oradakı "pedaqoji cövhəri", əxlaqi-tərbiyəvi mətləbləri yetərincə saf-çürük etmiş, onu məzmunlu bir şəkildə oxucuya çatdıra bilmişlər.

Pedaqoq alimlər tədqiqat obyekti kimi götürdükləri ədəbi simaların həyatına bir o qədər də geniş yer vermir, bu barədə müxtəsər məlumat verməklə kifayətlənirlər. Əslində bu, doğru mövqedir. Çünki hər üç sənətkarın həyatı barədə məlum olan faktlar ədəbiyyat tarixçiləri tərəfindən aşkarlanmış, dəfələrlə xatırlanmışdır. Buna görə də pedaqoji yönümlü tədqiqatda avtobioqrafik notlara geniş yer verməyə bir o qədər də lüzum görünmür.

Monoqrafiya giriş, üç fəsil, izahlar və şərhlər, nəhayət, istifadə olunmuş ədəbiyyat siyahısından ibarətdir. Girişdə Azərbaycanda pedaqoji fikrin zaman etibarı ilə tarixin dərin qatlarına gedib çıxdığı göstərilir, pedaqoji fikir tariximizi və irsimizi öyrənən alimlərin xidmətləri qeyd olunur, həmçinin "Azərbaycan məktəb və pedaqoji fikir tarixi" kursunun, buna binaən dərs vəsaitinin yaradılmasının zərurəti və əhəmiyyəti diqqətə çatdırılır.

Müəlliflər problemin qoyuluşuna və həllinə ayıq, həssas münasibət göstərirlər. Onlar çox doğru olaraq qeyd edirlər ki, sovet dönəmində aparılmış araşdırmaların bəzilərində marksizim-leninizm metodologiyasına istinad edildiyindən məsələlərin tədqiqi müəyyən məhdudiyyətlər çərçivəsində aparılmış, hakim konsepsiya ilə uyuşmayan fikirlər atılmış, beləliklə də, klassiklərimizin bir sıra daha gərəkli əsərləri çox hallarda diqqətdən kənarda qalmışdır. Monoqrafiya müəllifləri haqlı olaraq bir çox elmlərdə olduğu kimi pedaqoji təmayüllü tədqiqatlarda da Avropasentrizm təzahürlərinin subyektiv

və müəyyən yanlış nəticələrə gətirib çıxardığını söyləyirlər. Onlar hər şeyin ilkin, yaxşı, əsas və mütərəqqi olanının Avropada axtarılması prinsipinin səhv, bəşərin elmi-mədəni həqiqətlərinə illuziyalı münasibət olduğunu qeyd edirlər. Bunun islam şərqinin böyük şəxsiyyətlərinin yaradıcılığını, elmini, o cümlədən pedaqoji fikir və təlim-tərbiyə nəzəriyyəsini öyrənməkdə ciddi bir maneə, pərdə rolunu oynadığını əsaslandırmaqla bu yanlış mövqeyi düzəltməyin vaxtı çatdığını vurğulayırlar. Haqlı olaraq qeyd edirlər ki, tarixin bizə bəxş etdiyi indiki müstəqillik dönəmində pedaqoji təmayüllü tədqiqatlarımız obyektiv, ideologiyasız meyarlara əsaslanmalıdır. Əslində haqqında söhbət açdığımız bu monoqrafiya da həmin obyektiv, ideologiyasız meyarlara söykənən elmi araşdırmaların faydalı bir faktı kimi meydana çıxmışdır.

Kitabın I fəsli M.V.Vidadiyə, II fəsli M.P.Vaqifə, III fəsli isə Q.Zakirə həsr edilmişdir. Həcm etibarı ilə I fəsil nisbətən yığcamdır. Bu, M.V.Vidadinin bizə gəlib çatan əsərlərinin kəmiyyətcə azlığı ilə əlaqədardır. Cəmi 60-a qədər şeiri günümüzə gəlib çıxan Molla Vəlinin pedaqoji görüşləri, təlim-tərbiyə haqqında fikirləri ilə bağlı tam və əhatəli şəkildə danışmaq imkan xaricindədir.

Müəlliflər hər üç şairin bədii irsini nəzərdən keçirərkən "ələmə" əməliyyatı aparmalı olmuş, buradakı pedaqoji baxışları və onun mahiyyətini, başqa sözlə desək, "pedaqoji şirəni" üzə çıxarmalı olmuşlar. Onlar problemə həm filoloq, həm də pedaqoq düşüncəsi ilə yanaşmış, ədəbiyyatşünas fəhmi ilə pedaqoq duyumunu qovuşdurmalı olmuşlar. Doğrudan da, poeziyaya həssas bir ədəbiyyatçı qəlbi ilə yanaşmadan onu nəinki pedaqoji aspektdən, heç etik, estetik, fəlsəfi, linqvistik və s. mövqedən də obyektiv təhlil etmək mümkün deyil. Bu mənada F.Rüstəmov və İ.İsayev məsələyə ədəbiyyatşünas qəlbli pedaqoq alimlər kimi yanaşmışlar.

Əlbəttə, "Pedaqoji irsimizdən: M.V.Vidadi, M.P.Vaqif və Q.Zakir" adlı monoqrafiyanın məziyyətləri, uğurlu cəhətləri barədə daha geniş danışmaq olar. Əsərin məzmun və təhlil siqləti, problemin qoyuluşu və həlli bunun üçün geniş meydan verir. Biz məqalənin həcmini nəzərə alıb, deyilənlərlə kifayətlənir, monoqrafiyanı son illərdə pedaqogika elmimizdə atılan uğurlu addımlardan biri hesab edirik. Əminəm ki, bu monoqrafiya müəllimlərimizin diqqətinin bu sahəyə yönəldilməsinə yardımçı olacaqdır.

*Rəyçi: prof. R.Qafarlı*

**İstifadə edilmiş ədəbiyyat**

1. Araslı H. XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı. Bakı, 1956.
2. Səfərli Ə., Yusifli X. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 2008.
3. Vaqif və Vidadinin seçilmiş əsərləri. Bakı: Çaşıoğlu, 2004.

**Я.Бабаев**

**Исследуется педагогическая наследственность**
**Резюме**

Рецензируется книга профессора Ф.Рустамова и И.Исаева "Педагогическое наследие: М.В.Видади, М.П.Вагиф, К.Закир".

**Y.Babayev**

**Pedagogical heritage is investigated**
**Summary**

In the article our pedagogical heritage; Molla Vali Vidadi, Molla PanahVagif, and Gassim beck Zakir are investigated.

# ƏLİ XINALIZADƏNİN PEDAQOJİ GÖRÜŞLƏRİ

**Kərim Məmmədov**
***Bakı Slavyan Universitetinin professoru,***
***pedaqogika üzrə elmlər doktoru***

***Açar sözlər:*** *əxlaq və onun komponentlərinin şərhi, adın təhlili haqqında, şəxsiyyəti formalaşdıran amillər, irsiyyət, mühit, tərbiyə, fiziki tərbiyədə təbii amillərin rolu, uşaqların yaş xüsusiyyətləri, idraki proses və onun mərhələləri.*

***Ключевые слова:*** *мораль и комментарии его компонентов, об анализе имени, факторы формирующие личность: наследственность, окружение, воспитание, роль естественных факторов в физичиском воспитании, возрастные особенности, познавательный процесс и его этапы.*

***Key words:*** *morals and commentary of its componenets, analyses of name, personality forming factors, communication, condition, upbringing, the role of natural factors in physical education, children's age features, cognitive process and its stages.*

Türk dilində ilk dəfə əxlaqa dair yazılmış "Əxlaqi-Əlayi" əsərinin müəllifi Əli Xınalızadə Şərqdə bacarıqlı alim, dövlət və din xadimi kimi tanınmışdır.

O 1510-cu ildə Türkiyənin İsparta şəhərində anadan olmuşdur.

Əli Xınalızadə bir sıra elmi-pedaqoji əsərlərin müəllifidir. Bu əsərlər içərisində "Əxlaqi-Əlayi" əsəri mühüm yer tutur. Onun pedaqoji görüşləri də məhz bu əsərində özünün geniş şərhini tapmışdır. Xınalızadə bu əsəri 1563-1566-cı illərdə Dəməşqdə kadı vəzifəsində çalışarkən yazmış və onu Dəməşq bəylərbəyi Əli Əfəndiyə həsr etmişdir. Bu əsəri ərsəyə gətirərkən o, Əbuəli Miskəveyhin "Ət-Təharə" (türk mənbələrində "Təhzübül-əxlaq" kimi verilir (5;6)), N.Tusinin "Əxlaqi-Nasiri", Cəlaləddin Dəvvaninin "Əxlaqi-cəlali", Hüseyin Vaizinin "Əxlaqi-Mühsini" əsərlərindən bəhrələnmişdir.

"Əxlaqi-Əlayi" əsəri üç fəsildən ibarətdir. Onun I fəsli əxlaqın nəzəri və metodoloji problemlərinə həsr edilir. Əxlaqın komponentlərinin məzmunu, mahiyyəti açıqlanır. II fəsli "Ailə əxlaqı", III fəsli isə "Dövlət əxlaqı" adlanır. Oxuculara təqdim etdiyimiz bu məqalədə biz yalnız Əli Xınalızadənin tərbiyənin nəzəri məsələləri haqqındakı fikirlərinə toxunacağıq.

Əli Xınalızadə bu əsərini ərsəyə gətirməklə islam aləmində formalaşan əxlaqi dəyərləri, əxlaqi düşüncələri daha da zənginləşdirmişdir. Türk dünyasında islam mədəniyyəti, islam fəlsəfəsinin yayılması və təşəkkül tapmasında Əli Xınalızadənin bu əsəri mühüm rol oynamışdır. Bu əsərlə o, Türk dünyasını islam əxlaqına qovuşdurdu. Qurani-Kərimdə şərh edilən əxlaqi dəyərlərin geniş xalq kütlələrinə çatdırılmasında bu əsər əvəzsiz tərbiyə vasitəsinə çevrilmişdi.

Əli Xınalızadə daim kütlələr içində olduğundan insan psixologiyasına, fərdləri bir-birindən fərqləndirən səciyyəvi xüsusiyyətlərə dərindən bələd olmuş və onları bu əsərində əsaslı surətdə şərh etməyə nail olmuşdur.

Yüksək əxlaq sahibi olan Əli Xınalızadə bu əsərində bəzi insanların günahlar içində boğulduğu, sözü ilə əməlinin uyğun olmadığı halda özünü günahsız kimi təqdim etməyə çalışmasını pisləyir, az danışıb xeyirxah işlərlə məşğul olmağı vacib hesab

edir. O qeyd edir ki, hər bir şəxs təkcə insanlar arasında yox, tək olduğu zaman da mülayim xasiyyətli, comərd, iffətli, qayğıkeş olmalıdır (1,101). Müəllif burada Allah dərgahında yüksəlməyin, dünyada düzənli yaşamağa səbəb olacaq davranışların qazanılması yollarını incələyir. Əxlaqı ümumbəşəri dəyər kimi qiymətləndirən müəllif onun ictimai münasibətlərin tələblərinə müvafiq təkmilləşməsini də qeyd edir. O qeyd edir ki, tarix dəyişsə də əxlaqi dəyərlər öz mahiyyətini itirmir, o, yalnız təkmil hala gətirilə bilir. Müəllifə görə, "zamanın dəyişməsinə bağlı olaraq dövlətlərin, millətlərin, dinlərin dəyişməsi ilə dəyişən tarix hikmət elmlərini bölümləri arasına almaz" (1, 102-103).

Tədqiqatçıların yazdığına görə, o, son dərəcə sadə, mülayim, incəqəlbli bir insan idi. Kasıblara, xəstə və zəiflərə yardım etməyi vacib əxlaqi dəyər sanardı. Oğlu Həsən Çələbinin yazdığına görə, yoxsulun, fağırın sözünü vəzirin sözündən üstün tutardı. Onun yanına yoxsul, zəiflər gələndə üz-gözündə sevinc ifadə edilərdi (1,53).

Əli Xınalızadə haqsızlıqlara, ədalətsizliklərə qarşı çıxmağı əxlaqi dəyər kimi qiymətləndirir, özü də həyatda bunlara əməl edirdi. Elmi, ziyası ilə insanlara xidmət etməyi vacib şərt hesab edirdi. Elmi biliklər əldə etməyə özü də daim səy göstərirdi. Təkcə dini kitabları yox, həm də riyaziyyat, astronomiya, fəlsəfə, əxlaq, tarix, coğrafiya elmlərinə dərindən bələd idi. O, həmişə dünyəvi biliklər əldə etməyə çalışmış və bu əsəri yazarkən onlardan da bəhrələnmişdir. Özündən əvvəl əxlaqa dair yazılmış əsərləri kor-koranə təlqin etməmiş, öz düşüncə və mülahizələrini, yanaşmalarını da şərh etmişdir ki, bu da əsərin populyarlıq qazanmasına səbəb olmuşdur. Bu əsəri yazarkən o, əxlaqi dəyərlərin mahiyyətini şərh etməklə yanaşı, onun fəlsəfi, sosial-iqtisadi əsaslarını da açıqlamağa çalışmışdır. Əxlaqın şərəfli və yüksək bir amil olduğunu əsər boyu sübut etməyə nail olmuşdur.

Müəllif burada haqq, ədalət, mərhəmət, xeyirxahlıq, dostluq və bunların əksi olan rəzalət, qəbahət və s. kimi anlayışları incələyir. Müsbət keyfiyyətlərin formalaşmasının yollarını açıqlayır.

Ə.Xınalızadə bu əsər üzərində işləyərkən dini dəyərlərdən də geniş istifadə etmişdir. Qurandan, İncildən, Tövratdan yararlanmışdır. O, Quran ayələrindən əxlaqa dair nümunələr verərək, onları təhlil etmiş, bu problemə aid imamlardan, görkəmli din xadimlərindən misallar çəkmişdir. Əsərdə İmam Qəzaliyə daha çox yer ayrılmış, əxlaqa dair onun fikir və mülahizələri şərh edilmişdir.

Türk, ərəb və fars dillərində şeir yazmağı bacaran Ə.Xınalızadə bu əsərində əxlaqa dair öz fikirlərini şeirlə də ifadə etməyə çalışmışdır.

Özündən əvvəlki müəlliflərdən fərqli olaraq Ə.Xınalızadə qız uşaqlarının da təhsil almasını faydalı hesab etmişdir (1, 6). Bu, heç də təsadüfi deyildir. Çünki Ə.Xınalızadə ailə tərbiyəsini ümumi tərbiyənin əsası hesab edir. Ailə tərbiyəsini də əsasən ana həyata keçirir. Müəllif ailəni xalqın, dövlətin mənbəyi hesab edir. Onun fikrincə, əgər ailə uşaqlara düzgün tərbiyə verə bilirsə, o, fəzilət sahibi olur, xoşbəxt həyat yaşayır. Deməli, xalq da, dövlət də xoşbəxt olur. Bunun da əsasında məhz ailə tərbiyəsinin durduğunu göstərir.

Ə.Xınalızadə əxlaq elmi ilə tibb elmi arasında yaxınlıq görür. Əxlaq elmini tibbin ruhu adlandırır. Müəllifin bu yanaşması N.Tusinin yanaşması ilə həmahəng səslənir (4, 147).

Müəllif əxlaq elmi ilə yanaşı riyaziyyat, həndəsə, astronomiya və musiqi elmlərini də öyrənməyi tövsiyə edir. Zehnin, təfəkkürün inkişafında bunların rolunu qeyd edən müəllif, onları əxlaq elmi ilə əlaqəli öyrənməyi vacib sayır və bunların xalqın rifa-

hına, dövlətin çiçəklənməsinə xidmət etməsini vacib şərt hesab edir. O qeyd edir ki, elm ağacı əməl meyvəsini verməzsə, etibar görməz. İnsan nəfsi nəzəri hikmət sayəsində doğru etiqad və özünün lazımi elmləri əldə edib və cahillikdən qurtulduqdan sonra əməli hikməti əldə edə bilər (1,105). Onun fikrincə, elm və əməl kamil dərəcədə uzlaşarsa, insan dünyada mükəmməlləşər, səadətə qovuşar, həyatını düzgün istiqamətləndirə bilər.

Ə.Xınalızadə yazır ki, əməli hikmətləri qazana bilmək üçün insanın cahillikdən, bilgisizlikdən qurtarması, səhih etiqadları, doğru bilgiləri qazanması gərəkdir. Doğru inanclardan məhrum olan insan cəhalət və qaranlıqda qalaraq səhv hərəkətlərə yol verə bilir.

Onun fikrincə insanlardakı xasiyyət elə formalaşmalıdır ki, o, məlaikə halını ala bilsin… “Əgər insanlardakı özəlliklər məlaikə durumunda deyilsə, yəni yerləşik olmayıb tez də yox olursa, buna xasiyyət demək olmaz” (1, 107-108).

Ə.Xınalızadə irsi amilləri inkar etmir. Lakin əxlaqın irsi olub dəyişməməsi ideyasına qarşı çıxaraq, əxlaqa zidd hərəkətlərin tərbiyə yolu ilə islah edilməsinin mümkünlüyünü yazır. O qeyd edir ki, təbii qazanılan xasiyyəti tərbiyə yolu ilə dəyişdirmək mümkündür (1, 108-111). Burada da Ə.Xınalızadənin mövqeyi Əl-Qəzali və N.Tusinin mövqeyi ilə üst-üstə düşür (2, 46-47; 4, 78-79).

Ə.Xınalızadə irsi amillərin şəxsiyyətin formalaşmasındakı rolunu belə şərh edir: “Ürəmə gücü (K.M. irsi amillər) bənzərinin başqa bir şəxsdə təşəkkül etməsinə səbəb olan güc şəklində təzahür edər” (1, 148). O, bitki toxumu nümunəsini misal çəkərək göstərir ki, bitkilərdə ürəmə gücü bəzi parçaları ayırıb toxuma çevirər və bu toxumdan onun bənzəri olan bir varlıq meydana gələr.

Ə.Xınalızadə mühitin də tərbiyəyə təsirini qeyd edərək yazır ki, nəfsin cövhəri nə qədər nurani olsa da, qaranlıq təbiətlə qarşılaşanda insanlarda nalayiq xasiyyət də formalaşdıra bilir. Belə xasiyyətlərin bəzisi xeyirxahlığa sövq edən yardım ilə fitrətini dəyişdirə bilir, xeyirlər qazanır. Bunu qazanmaq üçün hər kəsin fitrətindəki nurani cövhərin üstünlük təşkil etməsi lazımdır (1, 110).

Ə.Xınalızadə cahilliyin, mədəniyyətsizliyin kökündə savadsızlığın dayandığını qeyd edərək yazır ki, cahil insanlar heyvana bənzəyir. Onlara insan adının verilməsi ruhsuz heykəllərə insan adının verilməsinə bənzəyir (1, 125).

O qeyd edir ki, insanın mədəni yüksəlişi, əxlaq mükəmməlliliyi, ağlı, kamalı, onun zəkası və bilikləri ilə ölçülür ki, bu da elm əldə etməklə başa gəlir.

Adıçəkilən bu əsərində Ə.Xınalızadə iqlim şəraiti, hava, su və s. kimi təbii vasitələrin insanların kamilləşməsindəki rolunu da qeyd edir. Münbit iqlim şəraiti, torpaq, suyun bolluğu insanların sıx məskunlaşmasına şərait yaradır ki, bu da mənəvi təkmilləşməyə səbəb olur. Bununla da müəllif tərbiyənin iqtisadi əsaslarının düzgün açıqlanmasına nail olur. Mərkəzdən uzaq, dağlıq regionlarda yaşayan insanların davranışındakı çatışmazlıqların olmasını onların cəmiyyət üzvləri ilə az təmasda olması ilə izah edir. İnsanlarda müşahidə edilən mənfi keyfiyyətlərin aradan qaldırılması üçün şiddətli alışdırma və qeyrətetmə metodunu faydalı hesab edir.

Bu əsərində Ə.Xınalızadə uşaqların yaş xüsusiyyətlərinə də toxunur. Onlardakı fizioloji dəyişikliklərin xüsusiyyətlərini açıqlayır. O yazır ki, böyümə ömrün sonuna qədər davam etməz, bəlli bir dövrə gəlincə dayanar. Bundan sonra insan şişmanlaşsa da, uzunluq artmaz.

Ə.Xınalızadə şüurun yalnız insana məxsus olduğunu qeyd edərək yazır ki, heyvanlar ağıl gücündən və məlaikiyyət özəlliyindən məhrumdur. Bu səbəbdən heyvan sırf arzu, şəhvət və unutqanlığında qalır.

O yazır ki, insan ağlı və iradəsi olmağına rəğmən əxlaqi dəyərlərə əməl etmirsə, heyvanlar kimi davranırsa, onlardan daha alçaqda dayanır. Daha sonra o qeyd edir ki, insanın kainatdakı yeri heyvanlıq ilə məlaikəlik arasındadır. Əgər insanlar düzgün tərbiyə almazsa, onlar heyvanlıq uçurumuna yuvarlana bilərlər. Düzgün tərbiyə alarsa, elmi biliklərə yiyələnərsə, o, kamilləşər, məlaikəlik zirvəsinə yüksələ bilər.

Ə.Xınalızadə bu əsərində idraki prosesə, onun mərhələlərinə də toxunur. Bəhmənyarda olduğu kimi (3, 118) o, idraki prosesi iki yerə ayırır: zahiri hissə və batini hissə. Zahiri hissəyə toxunma, qoxulama, dadma, eşitmə və görmə duyğularını aid edir. Batini hissəyə isə o, aşağıdakıları aid edir: müştərək duyğu, xəyal gücü, vəhm gücü, bəlləmə gücü, yaddasaxlama gücü (1, 152).

Ə.Xınalızadə şüurun yalnız insana məxsus olduğunu göstərir. O yazır ki, bu nəfsin qüvvətləri heyvanlarda yoxdur və bu qüvvətlər səbəbilə insan nəfsi heyvanlardan ayrılıb insaniyyət vəsfini qazanmışdır (1, 155). O, insanın bilmə, bilik əldə etmək, ondan yararlanmaq gücünə malik olduğunu söyləyir və qeyd edir ki, bu gücün gördüyü iş gözəl əxlaq və salih əməlləri kötü əxlaq və çirkin əməllərdən ayırıb, hansı davranışları həyata keçirmənin kamilliyə və xoşbəxtliyə, hansı davranışları yerinə yetirməyin isə əksiklik və kötülüyə səbəb olduğunu dərk etməkdir (1, 155). Şüur, ağıl vasitəsilə insan yanlış hərəkətlərdən uzaqlaşır, öz fəaliyyətini səmərəli qurmağı bacarır. O qeyd edir ki, şüur vasitəsilə insan mələki özəlliklərini heyvani özəlliklərdən üstün tutaraq, mələki özəlliklərini gəlişdirir və yetkinləşdirirsə, mələkdən daha üstün olur. Əksinə insanlar heyvani hislərə meyil edirsə, heyvanlardan da aşağıda olarlar (1, 162).

Əli Xınalızadənin bu əsərində söylədikləri pedaqoji fikir və ideyalar qloballaşan dünyamızda mənəvi dəyərlərimizin qorunub saxlanılmasında müstəsna əhəmiyyət kəsb edir. Bu ideyaların tədris müəssisələri, xüsusilə də pedaqoji kadrlar hazırlayan ali məktəb auditoriyalarına istiqamətləndirilməsi gənc nəslin düzgün tərbiyə olunmasında mühüm rol oynaya bilər.

*Rəyçi: prof. T.Əfəndiyev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ayişə Sidika Oktay. Kınalızade Ali Efendi və Ahlaki-Alayi. İstanbul, 2011.
2. Əbu Həmid Əl-Qəzali. Əməllərin nizamı. Bakı: Adiloğlu, 2007.
3. Məmmədov Z. Azərbaycanda XI-XIII əsrlərdə fəlsəfi fikir. Bakı, 1978.
4. Nəsrəddin Tusi. Əxlaqi-Nasiri. Bakı: Elm, 1989.
5. Kınalızade Ali Efendi ve Ahlak-i Alayi adlı eseri (aksitarih.com). Opera: 6.
6. Yahya Akyüz. Türk egitim tarihi. Eileti:pegem@pegem.net.

**К.Мамедов**

**Педагогические взгляды Али Хыналызаде**

**Резюме**

В статье освящаются мысли и идеи известного турецкого педагога А.Хыналызаде о нравственном воспитании, его компонентах, о женском образовании, роли наследственности, среды и воспитания в развитии личности, методах и средствах воспитания, в познавательном процессе и его структурных элементах.

**K.Mammadov**

**Ali Khinalizadeh's pedagogical approach**

**Summary**

In the article it is noted that the role of enhancing women's education on cognitive process, methods and means of upbringing play great role in developing personality.

***Təhsil islahatı fəaliyyətdədir***

# MƏZMUN DƏYİŞİKLİYİ PRİORİTET MƏSƏLƏDİR

**Tariyel Talıbov**
***riyaziyyat üzrə fəlsəfə doktoru***

**Elnarə Məmmədova**
***pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *qloballaşan, təhsilin məzmunu, tədris fənni, məntiq.*
***Ключевые слова:*** *глобализация, содержание образования, учебный предмет, логика.*
***Key words:*** *globalization, education content, subjects, logic.*

Qloballaşan dünyanın tələblərinə uyğun təhsil sistemini formalaşdırmaq hər bir ölkənin inkişaf səviyyəsini şərtləndirən əsas amillərdəndir. Bu istiqamətdə aparılan işlərin köklü həllində çox möhtəşəm bir sənədin “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın qəbul olunması mühüm əhəmiyyət kəsb edir. Strategiyanın reallaşdırılmasında təhsilin məzmununun yenidən qurulması strategiyada diqqət yetirilən ən ümdə məsələlərdəndir.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında məzmun birinci yerdə durur. Çünki beynəlxalq təcrübədə təhsilin məzmunu ilə bağlı məsələlərdən biri təhsil kurikulumlarının ölkənin sosial-iqtisadi inkişaf tələbləri və prioritetləri ilə sıx əlaqələndirilməsindən ibarətdir. Son məqsəd budur ki, kurikulumlar iqtisadi inkişaf məqsədlərinə xidmət edən bilik və bacarıqları, səriştəni aşılayan məzmuna malik olmalıdır. Bütün bunlar isə, elə əvvəlcədən standartlarda cəmləşdirilmiş və əlbəttə, öz əksini kurikulumlarda, innovasiyaların əhəmiyyəti, təhsilalanların müxtəlif sosial fəaliyyətə tətbiq olunması, onların tədris bacarıqlarının inkişafında tapmışdır. Ölkəmizdə son illərdə baş verən dəyişikliklər, təhsil sahəsində aparılan islahatlar müəllimlərin qarşısında çox mühüm vəzifələr qoyur. Fəal (interaktiv) təlim metodunun tədris prosesinə daxil edilməsi şagirdlərdə təfəkkür xüsusiyyətlərinin və yaradıcılığının formalaşmasına, təlim keyfiyyətinin yüksəldilməsinə müvafiq baza yaradır.

Təhsil standartlarının ümumi fənn məzmununun qurulması zərurətinə yalnız müasir təhsilin məqsədlərinə uyğun baxıla bilər. Məlumdur ki, təhsil dövlətin, cəmiyyətin və adamların özlərinin maraqlarına xidmət edən məqsədyönlü təlim-tərbiyə prosesidir. Ümumi təhsilin məqsədi isə adamın gündəlik peşə və sosial həyatda qarşılaşdığı problemləri müstəqil həll etməyə imkan verən çoxfunksionallı kompetensiyalara, humanistliyə, sərbəst istiqamətləndirilmiş seçimə və fərdi intellektual cəhdlərə hazır olması ilə şərtləndirilir. O, özünə və başqalarına hörmət edir, digər mədəniyyətlərə və millətlərə münasibətdə dözümlüdür, mühakimələrində sərbəstdir, diskussiya aparmağa hazırdır. Bu zaman təhsil prosesinin məğzi şagirdin özünürealizasiyası ilə müşahidə olunan ictimai təcrübənin məqsədyönlü surətdə şəxsi təcrübəyə çevrilməsi ilə nəticələnir.

Təhsilin məzmunu olaraq pedaqoji prinsiplərə uyğunlaşdırılmış ictimai təcrübə daha dəqiq desək, sosial təcrübə aspektində özünün bütün struktur tamlığında götürülmüş mədəniyyət olur. Bu mənada məzmun strukturuna (əlbəttə, həcmə görə yox) görə uyğun sosial təcrübəyə izomorf olur və özündə müasir mədəniyyətin bütün elementlərini saxlayır. Bu təyin olunmuş məzmun hazır bilik və təcrübədən başqa müəyyən məlum fəaliyyət növlərini də (yaradıcılıq fəaliyyət təcrübəsini, emosional-dəyər münasibətlərini və s.) özündə cəmləşdirir. Məhz bu elementlərin mənimsənilməsi adamın sadəcə olaraq cəmiyyətdəki sosial ierarxiyaya qoşulmasını yox, həm də işlərin mövcud durumunu dəyişdirməyə qadir olmasını təmin edir.

Sosial təcrübədə izomorf məzmun hər birisi müəyyən, xüsusi qavrama fəaliyyəti təcrübəsindən ibarət olan dörd əsas struktur elementindən ibarətdir. Bilik - qavrama fəaliyyətin nəticəsi forması kimi qeyd olunması, bacarıq - müəyyən məlum fəaliyyət növlərinin həyata keçirilməsi, yaradıcılıq fəaliyyəti - problem situasiyalarda bacarıq formasında standart olmayan həllərin qəbul edilməsi, emosinal-dəyər münasibətləri kimi başa düşülməlidir.

Son zamanlar bu dörd struktur elementinə şagirdin şəxsi təcrübəsini də əlavə etmək cəhdləri edilir.

Bu dörd növ təcrübənin mənimsənilməsi şagirdə pedaqoji ədəbiyyatda son dövrlərdə kompetensiya kimi adlandırılan mürəkkəb hərəkət növlərini həyata keçirməyə imkan yaradır. Məhz təhsil standartlarının böyük əksəriyyətində təhsilin məzmunu da belə təmsil olunur.

Təhsilin məzmununun qurulmasının başlanğıcı əsasən fəlsəfə və sosiologiya terminləri ilə ifadə olunur və həmçinin kütləvi informasiya vasitələrində, başqa sözlə, ictimai şüurda əks oluna bilən təhsilin ümumi məqsədlərinin şərhindən keçir. Növbəti mərhələ bu məqsədlərin psixoloji təsəvvürlərlə təhsilli adamın malik olduğu keyfiyyətlərin konkretləşdirilməsidir. Məsələn, ancaq psixologiya deyə bilər ki, yaradıcı şəxsiyyət hansı bacarıqlara malikdir. Və nəhayət, təhsilin məqsədini və ona çatmağın yollarını müəllim öz elminin dilinə çevirməlidir.

Beləliklə, təhsilin məzmunu şəxsi və ictimai determinə olunmuş (layihələşdirilmiş) şəkildə müəyyənləşdirilir. Belə də demək olar ki, təhsilin məzmunu pedaqogika fənnində öyrənilməsinə xüsusi didaktika tələb edən ictimai təcrübənin təhsil modelidir.

Əvvəlcə belə məzmun haqqında pedaqoji məqsədlər üçün əhəmiyyət kəsb edən nəzəri təsəvvürlər formalaşdırılır. Ümumi nəzəri təsəvvürlər - birinci səviyyədir. Burada təhsilin məzmunu tərkibin elementləri haqqında təsəvvürdən, bu elementlərin arasında əlaqədən (strukturdan) və onun pedaqoji traktovkasındakı sosial təcrübənin funksiyalarından ibarət olur. Ümumi formada şagirdlərə nəyi öyrətməyin vacib və mümkün olduğu qeyd olunur, özündə müəyyən məqsədləri cəmləşdirən təhsilin məzmununun şəxsi və sosial əhəmiyyətli hər bir böyük komponenti göstərilir. Həm bu səviyyədə, həm də bundan sonrakı səviyyələrdə təhsilin məzmunu yuxarıda qeyd olunan dörd struktur elementindən ibarət olur. Digər səviyyələrdə bu özünü başlanğıc nəzəri model kimi göstərən səviyyədən proyeksiyalama vasitəsi ilə alır.

İkinci səviyyə - burada nəyi öyrətmək haqqında təsəvvürlər konkretləşdirilir. Şagirdin fəaliyyəti zamanı, onun üçün ictimai təcrübənin şəxsi əhəmiyyət kəsb edən sahələri qeyd olunur. Tədris fənninin qurulmasında fənnin ümumi təhsildəki funksiyası həlledici rol oynayır. Bununla əlaqəli iki vacib məqamı qeyd edək. Birincisi, heç də bütün fənlər elmlərin əsasını təşkil etmir. Məsələn, “xarici dil” və ya “ədəbiyyat” adlı

elm yoxdur. İkincisi, fizika və ya tarix kimi fənlər öz elmlərinin qısaldılmış nüsxələri kimi təqdim oluna bilmirlər. Beləliklə, tədris fənninin məzmunu formalaşdırılarkən yalnız uyğun elmin daxili məntiqini yox, öyrənilən reallıqların digər sahələrini, həmçinin təlim prosesinin gedişi şəraitini və qanunauyğunluqlarını, hər bir şagirdin fərdi, yaş və digər xüsusiyyətlərini nəzərə almaq lazımdır.

Tədris fənninin yeri və funksiyası son mərhələdə təhsil prosesində iştirak edən bütün tərəflərin maraqlarının ifadəsi olan təhsilin məqsədi ilə müəyyənləşir. Əgər məqsəd qoyulursa ki, şagird xarici dildən müəyyən danışıq səviyyəsinə nail olsun, bu, o deməkdir ki, o uyğun elmin linqivistikasının əsaslarını mənimsəməli deyil. Əlbəttə ki, dərsliklərin və proqramların tərtibçiləri tədris materiallarını hazırlayarkən uyğun elmin nailiyyətlərindən istifadə edəcəklər. Onu da nəzərə almaq lazımdır ki, təlim praktikasında məqsədlərin formalaşdırılması mənbəyi olaraq yalnız elmi verilənlər yox, həm də təhsil subyektinin real xüsusiyyətləri və tələbləri  də nəzərə alınır.

Üçüncü səviyyə - burada məzmun tərkibinin birinci səviyyədə qeyd olunan, ikinci səviyyədə hər bir fənn üçün spesifik olan elementləri doldurulur. Söhbət konkret biliklərdən, bacarıqlardan, vərdişlərdən, qavrama məsələlərindən, tapşırıqlardan, müəllimlər və şagirdlər üçün nəzərdə tutulan tədris materiallarının məzmunla doldurulmasından gedir.

Yuxarıda qeyd olunan səviyyələr özündə ümumi orta təhsilin məzmununu pedaqoji uyğunlaşdırılmış sosial təcrübə kimi əks etdirir. Onlar həqiqətdə hələ realizasiya olunmamış, yalnız təsəvvürlərdə olan təhsil standartlarında konsentrik şərh olunmuş məzmundan ibarətdir.

Dördüncü səviyyədə - müəllim və şagird də prosesə qoşulur və məzmun layihədə yox, pedaqoji fəaliyyətdə təlimin praktiki fəaliyyətinin içində baş verir. Məhz bu prosesdə məzmunun “materiallaşdırılması” baş verir.

Beşinci səviyyədə - təhsilin məzmunu artıq özünü təlimin nəticəsi kimi göstərir. Layihələşdirilmiş məzmunun böyük əksəriyyəti təhsilalanın şəxsi malına çevrilir. Bununla da, proses başa çatmış olur.

Təhsil standartlarının tərtib olunması təhsilin məzmununun layihələşdirilmiş formalaşdırılmasının tərkib hissəsidir. Standartların bir metodiki-normativ sənəd kimi qurulması üçüncü mərhələdə başa çatır. Standartlar burada təhsil prosesinin son nəticəsinə, yəni beşinci səviyyəyə istiqamətlənmiş olurlar.

Standartlaşdırma – şagird şəxsiyyətinin strukturu səviyyəsində təhsilin məzmununun normativ daxil edilməsi metodudur. Təhsil standartlarının təyinatlarından biri nail olunacaq məqsədin diaqnozlaşdırılmasıdır. Ümumi orta təhsilin məqsədlərinin müəyyənləşdirilməsinə görə onun inteqral göstəricisi təhsillilikdir. Təhsilliliyə burada ictimai təcrübənin şəxsi təcrübəyə transformasiyası zamanı formalaşan şəxsiyyətin keyfiyyəti kimi baxılır.

Texniki-konstruktiv planda standartlara təhsilin məzmununun variativliyini müəyyənləşdirən çərçivə məhdudiyyəti kimi baxmaq lazımdır. Standart təhsilin o elementlərini müəyyənləşdirir ki, onlarsız hər bir təhsil mərhələsini başa vuran şagirdin təhsilini tamqiymətli hesab etmək olmaz. Bu, birinci növbədə məzmunun strukturuna aiddir. Verilən struktur standartda öz əksini tamamilə tapmalıdır. Bu, o deməkdir ki, yuxarıda qeyd olunan dörd element standartda təmsil olunmalıdır.

Birici səviyyəyə daha ətraflı baxaq. Bu səviyyədə  təhsilin məzmunu onun normativ şəklində fənnə qədər minimum formasında qeyd olunur. Məntiqin məlum qaydasından məlumdur ki, lazımi tərifin (və ya terminin)

verilməsi bu tərifin köməyi ilə həll edilən məsələlərin xüsusiyyətlərinə əsaslanır.

Bu halda təhsilin məzmununa formalaşma prosesində, onun dinamikasında baxı-

Məzmun xətləri və zolaqlara dair sxem



lır. Məzmunun statik hissəsi bir qayda olaraq konkret fənn məzmunlarının formalaşmasına qədər olur. O məzmunun modeli kimi çıxış edir və sonrakı işin gedişində konkretləşdirilir. Məzmunun ümumfənn məzmunu kimi formalaşması çox böyük önəm kəsb edir.

Bu, təxmini xətlər və zolaqlar sistemi doğma deyil, ancaq istiqamət götürmək üçün yararlıdır.

Yuxarıdakı səviyyələr hərəkətin inkişaf vektorunu göstərir, yəni ayrı-ayrı fənlərin və təhsil sahələrinin məzmunu konkretləşmədən öncə məzmun haqqında ümumi nəzəri təsəvvür yaradılır və beləliklə, hələlik ümumi halda, ancaq artıq pedaqoji uyğunlaşdırılmış təhsilin məzmununun zəruri minimumu hazırlanır. Bu fakt təhsilin məzmununun konkretləşdirilməsi istiqamətində birinci addım hesab olunr. Bu məzmun müəyyənləşdirilibsə onu fənlərüstü məzmun və ya metafənn məzmun (yunanca "meta"- arxasında duran) adlandırmaq olar.

Ümumfənn məzmununun qurulması prosesini konkret misalda nümayiş etdirək. Təhsilin məzmununun iki elementinə baxaq: qeyd olunmuş nəticələr formasında qavrama fəaliyyəti təcrübəsinə və məlum fəaliyyət növlərinin həyata keçirilməsi təcrübəsinə. Son nəticədə təlimin nəticəsi kimi, onlar ictimai təcrübədən transformasiya olunaraq hər bir şagirdin şəxsi bilik, bacarıq və vərdişlərinə çevrilmiş olurlar.

Məzmunun qurulmasının birinci mərhələsində sosial təcrübənin bu elementlərinin məzmuna daxil edilməsinin zərururiliyi müəyyənləşdirilir. Sonra ümumi formada minimum bilik, bacarıq və vərdişlər qeyd olunur, yəni standartda bu elementə aid nə nəzərdə tutulur. Məsələn, aydındır ki, o, əsas tarixi hadisələri bilməli, bunu bu və ya digər formada tətbiq etməyi bacarmalıdır. Ümumi bacarıqların minimumu müəyyənləşdirilir. Burada, həmçinin "fənlərə qədər" elementlər arasındakı əlaqələr aşkarlanır. Bu əlaqələr sonrakı mərhələlərdə fənlərarası əlaqə kimi konkretləşdirilir. Burada bilik və bacarıqlar daha konkret görkəm alır və təhsil şaxələnərək ayrı-ayrı fənlərə ayrılır. Nəhayət, üçüncü səviyyədə onlar bir başa dərsliyə və digər tədris materiallarına təlim mətnləri, çalışmalar, tapşırıqlar və s. məzmun daşıyıcıları formasında daxil olurlar.

Burada nümayiş etdirilən ierarxiya sistemdə hər bir sonrakı mərhələ əvvəlki mərhələyə əsaslanır. Bu hal bütövlükdə məzmunun tamlığının saxlanmasına, bölmələrdən birinin digərinin hesabına "şişməməsinə" şərait yaradır. Bütövlükdə, quruluşun birinci səviyyədəki materialları təhsilin digər səviyyələrdəki məzmunların müəyyənləşməsində istiqamətləndirici rol oynayır. Standartların formalaşdırılmasının şagirdlərə aid olan hissəsinin yeri üçüncü səviyyədir. Lakin bütövlükdə sənədin tamlığı, o cümlədən şagirdlərə və təhsil prosesinin özünə qoyulan tələblər o vaxt təmin olunmuş hesab olunardı ki, fənlərə qədər olan minimum materiallar da standartların, dərsliklərin tərtibatçıları və müəllimlər üçün istiqamətverici rol oynasın.

Burada şərh olunanlar standartların tərtibi üçün təhsilin məzmununun fənlərə qədər olan hissəsinin minimumunu hazırlamağa əsas verir. Ümumi fənn təhsil minimumu ümumi təhsilin məqsədlərinə əsasən işlənilir (bu standartların sonrakı layihələşmələrindən qabaqda gəlir) və təhsilin məzmununun dörd elementinin hamısını, ümumi halda yaradıcılıq fəaliyyəti də daxil olmaqla əhatə edir. Məsələn, ora aşağıdakı kimi yaradıcılıq fəaliyyəti təcrübəsinin ümumi xarakteristikaları daxil ola bilər: bilik və bacarıqların müstəqil olaraq yeni situasiyalara tətbiqi; tanış situasiyalarda yeni problemləri görmək; obyektin yeni funksiyalarını müəyyənləşdirmək; məlum fəaliyyət növlərindən müstəqil surətdə yenilərini qura bilmək; obyektin strukturunu qavraya bilmək; prob-

lemə alternativ, yeni yanaşmanın tapılması; məlum olanlardan və ya onların kombinasiyalarından prinsipcə fərqlənən yeni həllərin tapılması. Aydındır ki, bu yaradıcılıq fəaliyyətinin elementləri sonralar fənn məzmunu kimi, təhsil sahələrində və tədris fənlərində konkretləşə bilər və konkretləşdirilməlidir.

Təhsilin məzmununun dördüncü elementinin-“emosional dəyər” münasibətlərinin normativ formada əks olunması müəyyən çətinliklər törədir. Standartın bu sahəyə aid olan hissəsində şagirdin özündə olan xüsusiyyətlər, onların inkişaf mexanizmləri qeyd olunmalıdır. Məsələn: bu və ya digər hadisəni, özünün və digərlərinin hərəkətlərini, fikirlərini qiymətləndirməyi bacarmaq, mənəvi seçim tələb olunan situasiyalardan ləyaqətlə çıxa bilmək və s.

Bütün təhsil standartının və onun hər bir hissəsinin formalaşdırılması aşağıdakı qayda ilə aparılır; təlimin məzmun və prosessual tərəflərinin vahidliyi; təhsilin məzmununun məktəbdə necə olacağını təfərrüatı ilə bilməkdən prinsipcə vaz keçmək; standarta təhsilin məzmununun geniş fariativliklə qurulmasına şərait yaradan çərçivə məhdudiyyəti kimi başa düşülməsi.

Təhsil standartlarının ümumfənn məzmununun tərkibinə, quruluşuna və onun fənn məzmunları ilə münasibətinə baxaq. Standartın strukturunda təhsilin ümumfənn məzmununun yeri ümumi orta təhsilin pillələrinə aid olan hissələrdədir. Standartda ümumi orta təhsilin hər bir pilləsinin (ibtidai, əsas, orta) şərhində məzmunun aşağıdakı elementləri açıqlanır:

1. Ümumi təhsilin bu pilləsinin ümumi xarakteristikası, prioritetlər, dəyərlər və bu pillənin əsas xüsusiyyətləri. Mənimsəmənin normativ müddətləri, buraxılış sinif şagirdlərinin (əgər varsa) yekun attestasiyası və serfitikasiya verilməsinin qaydası və şərtləri və s.

2. Bu pillədəki təhsilin məqsədləri: a) bu pilləni bitirənlərin məqsədləri praqnozlaşdırıla bilən kompleks təhsil nailiyyətlər kimi; b) məktəbin məqsədi şagirdin təhsilinin təmini şərti (təhsil şəraiti, texnologiya, müəllim hazırlığı və s.) kimi.

3. Təhsilin ümumiləşdirilmiş məzmunu. Bu, fənlərüstü məzmun olub özündə ümumtədris bacarıq və vərdişləri, ümumiləşdirilmiş fəaliyyət növlərini və kompetensiyaları birləşdirir. Onlar bütün fənlərdən və fənn sahələrdən keçib gedir və məzmunun bütövlüyünə, tamlığına xidmət edir.

4. Təhsil sahələri və fənlər üzrə təhsilin məzmunu. Ümumiləşdirilmiş təhsilin məzmunu təhsil standartlarının fənlərüstü (ümumifənn, metafənn) məzmunu ilə qeyd olunur. Sonra ümumiləşmiş təhsilin tərkib hissələrini müəyyənləşdirmək və onları təhsil standartlarının yekun sənədinə daxil etmək üçün işləmək lazımdır. Bu elementləri ümumi halda sadalayaq və izah edək.

Təhsil standartlarının ümumifənn məzmununa daxildir:

- öyrənilən həqiqətlərin real obyektləri, o cümlədən fundamental təhsil obyekləri;
- öyrənilən həqiqətlər, o cümlədən fundamental təhsil obyektləri;
- öyrənilən həqiqətlər, o cümlədən fundamental problemlər haqqında ümummədəni biliklər;
- ümumi və ümumitəlim bacarıqlar, vərdişlər, ümumiləşdirilmiş fəaliyyət növləri;
- köçürülə bilən təhsil kompetensiyaları.

Qeyd edək ki, təhsil standartlarının bu qeyd olunan elementlərinin hər birinə həm təhsil pillələrinin sonunda ümumfənn məzmunu kimi, həm də hər bir tədris fənnində konkret mövzularda baxılır.

Ümumifənnin məzmununun vasitəsi ilə tədris fənləri vahid cəm halında birləşirlər. Ümumifənn məzmununun elementləri ümumi təhsilin həm şaquli istiqamətdə,

təhsilin pillələri arasında, həm də üfüqü fənlərarası əlaqədə sistem əmələgətirmənin əsasını təşkil edir. Təhsilin ümumfənn məzmununu təhsil standartlarının əsas komponenti olub həm təhsil proqramlarının məzmununun zəruri minimumunda, həm də buraxılış sinif şagirdlərinin hazırlıq səviyyələrinə qoyulan tələblərdə öz əksini tapır.

Təhsil standartlarının ümumifənn məzmununun əsas elementlərinə baxaq. Qavrama, reproditiv, yaradıcılıq fəaliyyətinin və emosional – dəyər münasibətlərin həyata keçirilməsi təcrübəsi real öyrənilən həqiqətlərə qarşı müvafiq fəaliyyət növlərinin tətbiqi ilə realizasiya olunur.

Bu real həqiqətlər: təbiət, mədəniyyət, texnika, sosial kommunikasiyalar və təhsil sahələrinin digər real obyektləridir. Beləliklə, təhsilin məzmununa yalnız həqiqətlər haqqında biliklər yox, həm də bu həqiqətlərin özləri də daxil olur.

Bu obyektlərə qarşı şagirdlərdə əsas kompetensiyalarda sistemləşmiş ümumtəhsil bilik, bacarıq, vərdişlər və fəaliyyət növləri formalaşdırılır.

Təhsil standartlarında real öyrəniləcək obyektlərin minimum siyahısı verilir. Bu obyektlərə aiddir: təbiət obyektləri (su, hava, od, torpaq, konkret heyvanlar və bitkilər, cazibə hadisəsi, Günəş və s.), mədəniyyət obyektləri (bədii mətnlər, arxitektura abidələri, incəsənət əsərləri, əmək və məişət alətləri, konkret ənənələr və mədəniyyət hadisələri), sosial obyektlər (müəyyən mallar, şagirdin ailəsi, real vətəndaşlıq prosesləri), texniki qurğular (kompyuter, telefon, televizor və s.)

Təhsilin ümumifənn məzmunu şagirdin ətraf aləmi müəyyən tamlıqda qavraması üçün müəyyən “düyün nöqtələrində” fokuslaşdırılır. Təhsilin məzmununun “düyün nöqtələri” kimi fundamental təhsil obyektləri çıxış edir.

Fundamental təhsil obyektləri təhsil standartlarında iki formada: real və bilik formasında iştirak edir. Real hissə bilavasitə öyrənilməsi zəruri olan ətrafdakı həqiqi obyektləri əks etdirir. Onlar: ağaclar, heyvanlar, bədii və digər mətnlər, incəsənət əsərləri, texniki qurğular, məişət avadanlıqları, təbiət və mədəniyyət hadisələri, sosial və digər təcrübələr, bilik isə anlayışlarda, kateqoriyalarda, ideyalarda, hipotezlərdə, qanunlarda, nəzəriyyələrdə, qaydalarda, normalarda, bədii prinsiplərdə, mədəni ənənələrdə və s. öz ifadəsini tapır. Məsələn, fundamental təhsil obyekti “ağac” bir tərəfdən ağacın özü kimi çıxış edir, digər tərəfdən - ağac haqqında ideya kimi, onun haqqında anlayış kimi məzmunda öz əksini tapır.

Fundamental təhsil obyektlərinin təhsil standartlarının ümumifənn tərkib hissəsinə seçilib salınması zəruriyyəti oradan irəli gəlir ki, onlar şagirdlər tərəfindən fərdi obrazlar kimi qəbul olunur və bunların hər birisinin şagirdlər üçün şəxsi mənası vardır. Şagirdlər tərəfindən real obyektlərin öyrənilməsində idraki proseslərinin bir çoxu (hiss obrazlarının yaranması, xassələrin ayrılması, səbəbin axtarılması, əlaqələrin və qanunauyğunluqların varlığı) baş verir.

Real təhsil obyektlərinin ümumfənn təhsilinin məzmununa salınması şagirdlərdə ideal biliklər sisteminin fərdi qurulmasına gətirib çıxarır. Bu hal məlumatın əvvəlcədən reallıqdan və fərdi fəaliyyətdən uzaqlaşdırılmış doqmatik qəbul edilməsinin qarşısını alır.

Təhsilin ümumfənn məzmununa öyrənilən elmlərin əsası, incəsənət, milli və dünyəvi ənənələr, texnologiya, tədris fənlərində və təhsil sahələrində əksini tapacaq insan fəaliyyətinin digər sahələri və s. daxil edilir. Bunlar: anlayışlar, qanunlar, prinsiplər, metodlar, hipotezlər, nəzəriyyələr, ənənələr, bədii və digər bəşəriyyətin əldə etdiyi fundamental nailiyyətlərdir.

Ümummədəni məzmun insan fəaliyyətinin müvafiq sahələrində çalışan mütəxəssislərin yaratdıqları ümumiləşmiş sosial təc-

rübənin əsasında qurulur. Bu insanlar: alimlər, şairlər, rəssamlar, musiqiçilər, mühəndislər və başqalarıdır.

Ümummədəni məzmunun tərkibinə, həmçinin bəşəriyyət tərəfindən həll olunan fundamental problemlər də daxil edilir. Qeyd edək ki, real təhsil obyektlərinin və onlar haqqında ümummədəni biliklər ayrı-ayrı siniflərə və fənlərə bölünməyə də bilər. Onlardan bir çoxu təhsilin bütün pillələrində iştirak edə bilər və yaxud az və ya çox formada fənlərdə öz əksini tapar.

Ümumi (ümumi təhsil) və ümumtəlim bacarıq, vərdiş və fəaliyyət növlərinin bir-birindən fərqləndirilməsi lazımdır. Əgər birincisi, daha çox təhsilin ümumifənn məzmununun mövzusuna daha çox aiddirsə, məsələn: ümumelmi anlayışlara və kateqoriyalara, ikincisi, tədris prosesinin özünə: şagirdin özünütəşkilinə, planlaşdırmaya, refleksiyaya, özünüqiymətləndirməyə və digər analoji növlərinə aiddir.

Təhsil kompetensiyalarının təhsilə fərdi-fəaliyyətdə yanaşılmanın nəticəsidir, şagirdin şəxsiyyətinə aid olub, müəyyən fərdi təşkil olunmuş kompleks fəaliyyətlər zamanı əmələ gəlir və belə şəraitlərdə də yoxlanılır. Kompetensiya (latın dilində competentia) adama yaxşı məlum olan sahələri, təcrübəni bildirir. Müəyyən bir sahədə kompetentlik, bu sahə haqqında əsaslandırılmış mühakimə yürütməyə, orada effektiv hərəkət etməyə imkan verən biliklərə və qabiliyyətəmalik olmaqdır.

Ümumi təhsil kompetensiyaları, bütün fəaliyyət sahələrinə aid olmayıb, yalnız əsas təhsil sahələrini və tədris fənlərini əhatə edir. Bu növ kompetensiyalar ümumi təhsilin fənn fəaliyyəti sahələrini əks etdirir və onun məqsədinə kompleks nail olmağa xidmət edir.

Təhsil kompetensiyalarının təhsilin praktiki normativ tərkibinə daxil edilməsi bizim təhsil sistemimizdə də mövcud olan bəzi problemləri həll etməyə imkan verir. Təhsil kompetensiyaları, yalnız şagirdin ayrı-ayrı bilik və bacarıqlarını mənimsəməyi tələb etmir, o həm də şəxsiyyət fəaliyyətli xarakterli müxtəlif kompetentlərin bu və ya digər sahədə kompleks əlaqəsini onun səmərəli tətbiqini tələb edir.

*Rəyçi: prof. A.Adıgözəlov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. "Azərbaycan məktəbi" jurnalı, 2013, № 5.

2. Müəllimlərin XIV qurultayında Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarovun məruzəsi, "Azərbaycan məktəbi" jurnalı, 2014, № 1.

3. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı, 1999.

4. Kərimov F., Əhmədov M., Varimski G., Reyli Ə. İnteraktiv kurikulum: mahiyyəti və nümunələr. Bakı: Adiloğlu, 2006.

5. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.

**Т.Талыбов,**
**Э.Мамедова**

**Изменене содержаня – приоритетная задача**

**Резюме**

Изменение содержания - одно из приоритетных задач в новом курикулуме по математике. Эти изменения должны быть отражены в процессе учёбы.

**T.Talibov,**
**E.Mammadova**

**Maintenance change is the priority issue**

**Summary**

The article is dealt with the maintenance changes on mathematics which is regarded priority issue. They must be taken into account in teaching process.

# YENİDƏNHAZIRLANMA TƏHSİLİNİN MODERN-LƏŞDİRİLMƏSİNİN PEDAQOJİ KADRLARIN HAZIRLIĞINA TƏSİRİ

**Lalə Qurbanova**
***Azərbaycan Müəllimlər İnstitutunun Zaqatala filialının əlavə təhsil üzrə direktor müavini***

***Açar sözlər:*** *Əlavə peşə təhsili, kadrların yenidənhazırlanması, innovasiyalar, inteqrasiya, idarəetmə, qloballaşma, modernləşdirmə.*

***Ключевые слова:*** *дополнительное профессиональное образование, переподготовка кадров, инновации, интеграция, управление, глобализация, модернизация.*

***Key words:*** *additional professional education, staff training, innovations, integration, management, globalization, modernization.*

Cəmiyyətin və təhsilin inkişafı müasir dövrün peşəkar təhsil sisteminin, həmçinin müəllim kadrlarının hazırlanmasının modernləşdirilməsi ilə müəyyən olunur. Azərbaycan Sovet Ensiklopediyasında “modernləşdirmə” anlayışı-ən yeni, müasir tələb və normalara müvafiq dəyişikliklər kimi izah olunur.

“XXI əsrin əvvəllərində “modernləşdirmə” yeni məna kəsb edərək sosial-mədəni sahəyə istiqamətlənir. Bu, Azərbaycan üçün yeni tip innovasiya modelidir. O da özündə məzmunca üç əsas faktordan ibarətdir:

- dövlətin aparıcı rolunu möhkəmləndirmək;
- ictimai inkişafın aparıcı istiqamətlərinə resursları mərkəzləşdirmək;
- innovativ iqtisadi formalaşdırmaq, vətəndaş cəmiyyəti institutlarını inkişaf etdirmək və bunları müasir Azərbaycanın modernləşdirilməsinə yönəltmək.

Sosial-mədəni modernləşdirmə vətəndaşların innovasiya xarakterli fəallığının formalaşmasında kadr, maliyyə, informasiya resurslarının cəlbi, insanları ömürboyu mənəvi, sosial, elmi-texniki, intellektual inkişafa istiqamətləndirən, cəmiyyətin mənəvi birliyini ümummilli prioritetlərə yönəldən normalardır. Bu modernləşdirmə cəmiyyətin tələbatlarına uyğun olaraq və dövlətin real aparıcı qüvvəsinə istinad edərək cəmiyyətin tələbatlarının ödənilməsinə istiqamətlənir”.

Yenidənhazırlanma təhsili ilkin baza təhsili proqramları ilə yenidən əldə ediləcək ixtisasın baza təhsili proqramı arasındakı fərqin bir tədris ilinə hesablanmış saatdan çox olmaması şərti ilə mütəxəssislərə verilən əlavə təhsildir. Proqramlar arasındakı fərq yenidənhazırlanma təhsili verən müəssisə tərəfindən müəyyən edilir.

Yenidənhazırlanma təhsili aşağıda göstərilən hallara uyğun kadrların hazırlanması tələbatı yarandıqda müvafiq proqramlar əsasında həyata keçirilir.

- Peşə-ixtisas təhsilində yeni ixtisaslar üzrə mütəxəssis hazırlığına başlandıqda, bu ixtisaslar üzrə təhsilverənlərin yenidənhazırlanması;
- İlkin kadr hazırlığı kifayət etməyən ixtisaslar üzrə yenidənhazırlanma;
- Müəyyən müddət işləmiş qeyri-ixtisas təhsilli kadrların işlədiyi ixtisas üzrə yenidənhazırlanması;
- Sahənin təşkili və idarə olunması üz-

rə kadrların yenidənhazırlanması.

Kadrların yenidənhazırlanması əlavə peşə təhsili strukturunda innovasiya sistemidir. Onu xarakterizə edən cəhətlər bunlardır: dinamiklik, təkamüllük, uyğunlaşma, sistemin strukturunun funksional diferensiasiyasının dərinləşməsi, onun elementlərinin daxili inteqrasiyası və qarşılıqlı təsiri, özünütəşkiletmə. Kadrların yenidənhazırlanması sisteminin inkişafı üçün təlim prosesinin idarə olunmasının təşkili mühüm əhəmiyyət kəsb edir. Bu sahədə tədqiqatlar aparan alimlər belə qənaətə gəlmişlər ki, müasir dövr aşağıdakı cəhətlərlə xarakterizə olunur:

- Texnoloji imkanların genişləndirilməsi;
- Təcrübi və nəzəri tədqiqatların inteqrasiyası;
- İnformasiyanın artması və cəmiyyətin tələblərinin dinamik dəyişməsi şəraitində innovasiya proseslərinin tətbiqi.

Modelləşdirmə obyektin adaptasiyasına və keyfiyyətin yaxşılaşdırılmasına istiqamətlənən qanunauyğun prosesdir və o, resursların paylanması ilə bağlıdır, lakin inkişafın hər mərhələsində yox, o zaman ki, cəmiyyətin və təhsilin inkişafı bunu tələb edir. Təhsil sistemi yeni dəyərləri mütəmadi qəbul etməzsə, iflasa uğraya bilər. Son illərdə baş verən hadisələr, cəmiyyətin tələbləri və təhsildə gedən dəyişikliklər onun modelləşdirilməsinə zərurət yaradır.

Modelləşdirmə həyata, dünyaya və insanın özünün özünə dəyərli münasibət bəsləməsinə istiqamətlənən ardıcıl dəyişiklikdir. Azərbaycan Sovet Ensiklopediyasında "modelləşmə" anlayışı-təcrübənin, sınağın obyekt üzərində deyil, onun müəyyən surətdə tərtib olunmuş əvəzedicisi üzərində aparılması kimi izah olunur.

Bu gün respublikamızda hərtərəfli hazırlığa, yüksək peşə keyfiyyətlərinə malik, öz əməyini və həyatını gənc nəslin düzgün formalaşmasına, müstəqil dövlətimizin əsl vətəndaşı kimi tərbiyə olunmasına həsr edən müəllimlərə ehtiyac çoxdur.

Azərbaycan təhsilində əsas istiqamətlərdən biri də müəllim hazırlığı ilə əlaqədardır. Müəllim hazırlığı üzrə aparılan işlər Azərbaycan Respublikasında bu sahənin müasir tələblərə cavab verən səviyyəyə qaldırılması, daha keyfiyyətli və yaradıcı işləmək qabiliyyətinə malik olan pedaqoji kadrların hazırlanması, yenidənhazırlanması, ixtisasının artırılması və bu hazırlığın müasirləşdirilməsi, beynəlxalq təcrübə və milli ənənələr əsasında məzmunun, strukturun, pedaqoji təhsil müəssisələrində bütün pedaqoji proseslərin daha da təkmilləşdirilməsi və optimallaşdırılması məsələlərini əhatə edir. Bu baxımdan ixtisasartırma və yenidənhazırlanma təhsilinin rolunun artırılması, bu istiqamətdə və təşkilati mexanizmlərin yeni tələbata uyğun həyata keçirilməsi daim diqqət mərkəzində saxlanılır.

Son illərdə təhsilin, o cümlədən əlavə təhsil sisteminin modernləşdirilməsi istiqamətində ciddi addımlar atılmış, mühüm islahatlar həyata keçirilmişdir.

Postsovet məkanında fəaliyyət göstərən əlavə təhsil sisteminə ilk növbədə sistemli və fəaliyyətyönümlü yanaşma. XX əsrin sonu, XXI əsrin əvvəllərində isə təhsilə yanaşmada dəyər paradiqması meydana gəldi və əlavə təhsildə aksioloji meyillər aşağıdakı istiqamətdə özünü büruzə verdi:

- Təlimin praktikyönümlü olması;
- Peşə əhəmiyyətli biliklərin inteqrasiyası, elmlərarası əlaqələrin və fikirlərin inkişafı;
- Peşə təhsili proqramlarının humanist məzmununun aktuallaşdırılması;
- Təlimalanlara pedaqoji dəstəyin diferensiasiyası;
- Təhsil müəssisəsinin strukturunda fasiləsiz təhsil istiqamətini təlim prosesinin çevik modeli kimi təmin edən bölmələrin yaranması.

İdarəetmənin mühüm istiqamətlərindən biri kimi həyatda, təhsildə dəyərlərdən danışılmasına baxmayaraq, idarə edən kadrların idarə olunan fəaliyyətə münasibətinin dəyişdirilməsi bu gün də aktuallığı ilə diqqət cəlb edir. Belə ki, təlimalanların peşə motivasiyasının inkişafı aksiologiyanın əsas anlayışı olan "dəyər münasibəti" ilə əlaqələndirilməlidir. Kadrların yenidənhazırlanması sistemi dəyər yanaşmasına yox, əsasən məqsədli yanaşmaya əsaslanır. Müvafiq resursların tətbiqi, idarəetmədə sistemli diferensiasiyanın reallaşdırılması, funksional strukturların fəaliyyətində razılığın əldə olunması və bəzi digər vacib məsələlərin həllinə yönələn layihələrə daha ciddi yanaşılması olduqca mühüm əhəmiyyət kəsb edir.

Təhsilin idarə olunmasının modernləşdirilməsi layihələrin idarə olunması ilə sıx bağlıdır. Bu, onunla izah olunur ki, layihələr metodoloji resursların məzmun inteqrasiyasının formasıdır; onlar təhsilin, təlimin və özünümüəyyənləşdirmənin komponentlərini özündə inteqrasiya edir.

İdarə olunan proses kimi təhsilin modernləşdirilməsi, onun inkişafının spesifikliyi dəyərlərin dinamikasının nizamlanması ilə qarşılıqlı əlaqədə nəzərə alınmalıdır. Dəyişikliklərdə uğurlu nəticələrin ən zəruri şərti təlim prosesinin bütün subyektlərinin psixoloji mədəniyyəti ilə bağlıdır.

Modernləşdirmə eyni zamanda cari proseslərin elmləşdirilməsi ilə əlaqədar olduğundan, təbii ki, təhsilin idarə olunması mütləq və qanunauyğun şəkildə ümumi elmi metodologiyaya (yeni metodlar, metodoloji yanaşmalar, elmi biliklərin funksiyaları) əsaslanmalıdır.

Təcrübə göstərir ki, kadrların yenidənhazırlanması və idarə olunması sisteminin modernləşdirilməsinə ən vacib vasitə kimi yalnız əsas peşə təhsilinin deyil, həmçinin əlavə peşə təhsili proqramlarının tətbiqini nəzərdə tutan çevik quruluşa malik təlim məzmunu kimi baxılmalıdır. Qeyd etməliyik ki, modernləşdirmə bilavasitə modelləşdirmə və layihələndirmə anlayışları ilə bağlıdır.

Araşdırmalar göstərir ki, modelləşdirmə layihələndirmədən daha çevikdir. Çünki dinamik model daxili inteqrasiyada daha stabil və sərbəstdir. Layihəndirmə iki komponentdən ibarətdir. Model anlayışı isə üç komponenti əhatə edir: dəyər, məqsəd, nəticə. Bundan başqa xarici mühitin təsiri nəticəsində yaranan dəyərlər də var. Təhsil sistemində onlara da həsas yanaşmaq vacibdir.

Təhsilin inkişafının ümumi qanunauyğunluqları pedaqoji kadrların yenidənhazırlanması prosesinin idarə olunması qanunauyğunluqlarını müəyyən edir. Bu baxımdan aşağıdakı müddəalara diqqət yetirək:

1. Təhsil nizamlı və qeyri – nizamlı mexanizmləri özündə inteqrasiya edir. Lakin onun davamlı olması birinci xarakteristikanın (nizamlı) dominatlığı şəraitində mümkündür. Bu təhsil sistemi və təlim prosesi səviyyəsində təhsilin idarə olunmasının başlıca şərtidir.

2. İnnovasiyalar təlim prosesinin dinamikasını müəyyən edir.

3. Təlim prosesinin inkişafında nizamlılıq sistemi öz mahiyyətini qoruyub saxlamaq qabiliyyətini təmin edir.

4. Nizamlılığı aktual inkişaf zonası, qeyri-nizamlılığı isə (innovasiya prosesləri, innovasiyalar) təhsil sisteminin yaxud perspektiv inkişafında mümkün mexanizmlər və texnologiyalar səviyyəsi kimi nəzərə alınmalı və təlim prosesinin idarəolunmasında hər iki istiqamətə diqqət yetirilməlidir.

İdarə orqanlarında innovasion proseslərin qeyri–nizamlılığın nəzərə alınması təhsilin idarə olunmasında səriştəliliyin yüksəldilməsinə müsbət təsir göstərir ki, bunu da yenidənhazırlanma sisteminin modernləşdirilməsində nəzərə almaq vacib şərtlərdən biridir.

İdarəetmə konsepsiyasında ümumi

elmi metodologiyanın gücləndirilməsinə, idrakın ümumi elmi metodlarının istifadə edilməsinə, immitasiya və onun modellərinə, təcrübi metodikalara, məsələn, ssenarinin planlaşdırılmasına istinad etmək zəruridir. Çünki onların tətbiqi seçim, dialoq, məqsədə çatmaq üçün dəyərlərin və resursların uyğunlaşdırılması strategiyasını həyata keçirməyə imkan verir.

Cəmiyyətin inkişafının, dəyərlərin və təhsilin inkişafının məqsəd və qanuna uyğunluq meyillərinə, innovasiya ilə yeniləşmə şəraitində pedaqoji kadrların yenidənhazır-lanması sistemində verilən tələblərə, inteqrasiya, qloballaşma və təhsildə idarəetmənin sosiomədəni prinsiplərinə aşağıdakıları aid etmək olar:

- ardıcıllıq prinsipi (pedaqoji kadrların yenidənhazırlanması sisteminin inkişafının təkamülü);
- mənəviyyat, mədəniyyətə müvafiqlik, insanın və təhsilin dəyəri, təlim fəaliyyəti prinsipi;
- idarəetmənin sistemli, dəyərli inkişafı;
- inkişafda nizamlılıq və qeyri–nizamlılığın (innovasion proseslərin) qarşılıqlı əlaqəsi, qarşılıqlı təsirin nəzərə alınması prinsipi;
- insan fəaliyyətinin bütün növlərində sistemli elmi və konseptual biliklərin rolunun gücləndirilməsi prinsipi;

Buradan da iki tələb meydana çıxır:

- mədəniyyətlər arası qarşılıqlı təsirin və əməkdaşlığın genişləndirilməsi;
- idarəetmənin elmliyinin yüksəldilməsi; 1) fəlsəfi səviyyədə; 2) ümumi elmi səviyyədə-ümumi elmi əhəmiyyətli metodların tətbiqi modelləşdirmə; idarəetmədə fənlərarası qarşılıqlı əlaqələrin genişləndirilməsi; iqtisadi–modelləşdirmə və proqnozlaşdırmanın, iqtisadi-pedaqoji modelləşdirmənin və təhsilin proqnozlaşdırılmasının istifadə edilməsi; 3) konkret elmi səviyyədə-dəyərli istiqamətləndirici sistem və təlim texnologiyalarının sosio mədəni funksiyalarını aktuallaşdıran təhsil məzmununun layihələndirilməsi (senarilər-seçim, dialoq, layihə və b.): 4) idarəolunan personala fərdi yanaşmanın gücləndirilməsi; fasiləsiz təhsil prinsipinin və bu prosesdə subyektin şəxsiyyətyönümlü inkişafı.

Pedaqoji kadrların yenidənhazırlanmasının idarəolunmasının sisteminin prinsip və qaydalarının reallaşdırılması sosiumun innovasion inkişafının xarakteristikası ilə bağlıdır. İnnovasion yeniləşmə cəmiyyətin ümumi qanunauyğunluğudur. Şübhəsiz ki, bu öz təsirini təhsildə də biruzə verir.

Pedaqoji kadrların yenidənhazırlanması sistemində təhsilin məzmunu haqqında xüsusi olaraq qeyd etmək lazımdır. Burada tədris planları, proqramları və materiallarının modernləşdirilməsi zərurəti meydana çıxır.

İxtisasın artırılması sistemi ilə pedaqoji kadrların yenidənhazırlanması arasında fərq olduğuna baxmayaraq, məhz təhsilin məzmunu müasir devrin tələblərinə uyğun, təlimin elmiliyinə müvafiq əlavə təhsilin müxtəlif proqramlar üzrə hazırlığını bir-birinə yaxınlaşdırır. Eyni zamanda müdavimlərin marağını nəzərə alaraq fərdi kursların təşkili də zəruri hesab edilir.

Fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının beynəlxalq inkişaf tendensiyaları XX əsrin sonlarında və XXI əsrin əvvəllərində inkişaf etmiş qabaqcıl dünya ölkələrinin yenidənhazırlanma təhsilində aşağıdakı inkişaf tendensiyalarını müşahidə edir:

- pedaqoji təhsil sistemində əmək haqqının atrırılması yolu ilə müəllim və tərbiyəçilərin sosial statusunun və həyat səviyyəsinin yüksəldilməsi;
- məktəbdə, ailədə və pedaqoji təhsil müəssisələrində müəllim sənəti üzrə peşəyönümünə diqqətin artırılması;

- yenidənhazırlanma üzrə bütün elmi nailiyyətlərin əks etdirən səmərəli təlim proqramlarının işlənilməsi;

- pedaqoji təhsil müəssisələrində tədris edilən pedaqoji–psixoloji fənlərinin sayının artması, bu halda seçmə və interaktivlik prinsiplərində daha geniş istifadə edilməsi;

- təlim prosesində innovasiya–kommunikasiya texnologiyalarından, müasir təlim metodlarından və yeni pedaqoji texnologiyalardan istifadə edilməsi;

- pedaqoji təcrübə müddətinin artırılması və bu müddətdə müdavimlərdə öz sənətinə uyğun praktiki vərdişlərin əldə edilməsi üçün müstəqilliyin və fəallığın inkişaf etdirilməsinə diqqətin gücləndirilməsi;

- yeni işə qəbul edilən gənc müəllimlərin peşə fəaliyyətinə himayədarlıq edilməsi;

- müəllimin yenidənhazırlanma təhsilinə diqqətin artırılması, bu prosesdə şəxsiyyətyönümlü təlim üsullarından istifadə edilməsi və yenidənhazırlanma təhsili proqramlarının müəllimlərin ehtiyaclarına, arzu və istəklərinə uyğun olaraq hazırlanması;

- məktəbdə əsaslı yenidənhazırlanma modelinin daha geniş tətbiq edilməsi .

Təcrübə göstərir ki, təqdim etdiyimiz yeni məzmun və texnologiyalar eksperiment rolunu oynadıqdan sonra pedaqoji kadrların yenidənhazırlanmasında müvəffəqiyyətlə istifadə oluna bilər.

Yuxarıda deyilənlərdən belə nəticəyə gəlmək olar ki, pedaqoji kadrların yenidənhazırlanmasında təlim prosesinin modernləşdirilməsi pedaqoji peşə səriştəliliyinin inkişafına xidmət edən bütün komponentlərinə vəhdətlə yanaşma (vahidlik prinsipi) prinsipi əsasında həyata keçirilməsi mümkündür. Deyilən qanunauyğunluqlar və prinsiplər əsasında qurulan idarəetmə inkişaf etdirici olduğu üçün keyfiyyətin yüksəldilməsi üçün zəmin yaradır.

*Rəyçi: prof. M.Həsənov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əzizov R. İxtisasartırma təhsili pedaqoji kadrların ehtiyaclarının təminatçısıdır. Təhsil, 2013.

2. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı: Mütərcim, 2007, s.452.

3. Hüseynov Ş. Müəllim kadrlarının hazırlığı və onlarla aparılan işin bəzi məsələləri //Azərbaycan məktəbi, 2003, № 2, s.27-30.

4. Əliyev V. Müəllim hazırlığı prosesində peşə keyfiyyətlərinin formalaşdırılması yolları: Ped.e.n..diss. ...Avtoreferatı, Naxçıvan, 2004, s.23.

5. Яковлева Н. Модернизация системой управления педагогических кадров. // Педагогика. 2010. № 10, стр.50.

**Л.Курбанова**

**Влияние модернизации системы переподготовки на подготовку педагогических кадров**

**Резюме**

В статье раскрывается сущность управления переподготовки педагогических кадров. Указываются направления и факторы модернизации системы переподготовки педагогических кадров, взаимосвязи инноваций и традиционных методов, предлагаются принципы и требования модернизаций и управления системы переподготовки педагогических кадров в Азербайджане.

**L.Gurbanova**

**The influence of modernizing of education to the repreparation of pedagogical cadres**

**Summary**

The article is dedicated to the essence of management of pedagogical staff retraining. Modernization directions and factors of teachers retraining system are indicated here. At the same time the author proposes the principles and requirements of modernization pedagogical staff retraining system.

# PEDAQOJİ KADRLARIN İXTİSASARTIRMA TƏHSİLİNƏ MÜASİR YANAŞMALAR

**Mahirə İbadova,**
**Şükür Qəribov**
***Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun aparıcı əməkdaşları***

***Açar sözlər:*** *pedaqoji kadrlar, ixtisasartırma, şəxsiyyətyönümlü təhsil, yeni model, metodkabinet, regional mərkəz, monitorinq və qiymətləndirmə.*

***Ключевые слова:*** *педагогические кадры, повышение квалификации, личностно-ориентированное обучение, новая модель, методкабинет, региональный центр, мониторинг и оценивание.*

***Key words:*** *pedagogical cadres, improvement of professional skills, forming personality, new model, methodological cabinet, regional centre, monitoring and assessment.*

Azərbaycan xalqının ümummilli lideri, ulu öndərimiz Heydər Əliyevin imzaladığı "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nda təhsil sisteminin müasirləşməsinə, təhsilimizin dünya təhsil sisteminə inteqrasiyasına nail olmaq məqsədi ilə əlavə təhsilin də yenidən formalaşmasına böyük ehtiyac olduğu müvafiq bölmələrdə (bölmə 2.1.2, bölmə 2.3.2.) göstərilmişdir.

İslahat Proqramının tələblərinə uyğun olaraq Təhsil Nazirliyi də müvafiq hüquqi – normativ sənədlər hazırlamış və təhsil sistemində həyata keçirilməsinə başlanılmışdır.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2007-ci il 25 iyun tarixli 102 nömrəli qərarı ilə təsdiq edilmiş "Azərbaycan Respublikası fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiyası və Strategiyası"nda göstərilir ki, (2.3) müasir dövrdə müəllim əxlaqi cəhətdən inkişaf etmiş, yaradıcı şəxsiyyət olmalı, refleksiya qabiliyyətinə, peşə vərdişlərinə, pedaqoji ustalığa malik olmalı və yenilikçiliyə meyilli olmalıdır. Müəllim təhsilin əhəmiyyətini dərk etməli, mədəni olmalı, öz fənnini, pedaqogika və psixologiyanı gözəl bilməli, şəxsiyyətyönümlü pedaqoji üsullardan istifadə etməli, öz intellektual səviyyəsini daim inkişaf etdirmək üçün çalışmalıdır.

Müəllim yenilikçi, yaradıcı düşüncəyə malik olmalıdır. Pedaqoji fəaliyyətin yaradıcı istiqamətlənməsi müəllimdən aşağıdakıları tələb edir:

- öz imkanlarını obyektiv qiymətləndirmək, öz sənəti üçün əhəmiyyətli olan zəif və güclü cəhətlərini müəyyən edə bilmək (özünüidarə, özünüqiymətləndirmə, emosionallıq, kommunikativ didaktik qabiliyyətlər və s.);
- intellektual fəaliyyət (düşüncə, yaddaş, qavrama, təsvir, diqqət) mədəniyyətinə, davranış mədəniyyətinə, ünsiyyət mədəniyyətinə, o cümlədən pedaqoji mədəniyyətə malik olmaq;
- inteqrasiya proseslərinə, dünya təhsil məkanının inkişaf tendensiyasına uyğunlaşa bilmək.

Hüquqi-normativ sənədlərdə göstərilən bu məsələlərin icrasını təmin edərək ala-

və təhsilin inkişafına daha ciddi yanaşılmış, bu sahədə müvafiq işlər görülmüşdür.

Müəllimlərin ixtisasartırma təhsilinə ehtiyacları öyrənilir, müasir təlim metodları və texnologiyalarının tətbiqi ilə bağlı seminar və treninqlərin keçirilməsinə diqqət yetirilir. Bu istiqamətdə respublikanın müxtəlif regionlarında olan müəllimlərə lazımi metodik kömək göstərilir. Onların peşə-ixtisas bacarıqlarının yeni informasiya və dünyanın qabaqcıl təcrübələri ilə zənginləşdirilməsi vacib şərtlərdəndir. Müəllimlərin ixtisasının artırılması əsasən, AMİ və onun filiallarında, BPKİYİ, ADPU və əlavə təhsil mərkəzlərində həyata keçirilir.

2009-cu ildə qəbul edilmiş “Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu”nun 24-cü maddəsi bütövlükdə əlavə təhsilin inkişafına yönəlmişdir. Bu maddədə əlavə təhsilin istiqamətləri aşağıdakı kimi göstərilmişdir:

- ixtisasartırma;
- kadrların yenidən hazırlanması;
- stajkeçmə və kadrların təkmilləşdirilməsi;
- təkrar ali təhsil və orta ixtisas təhsili;
- dərəcələrin yüksəldilməsi;
- yaşlıların təhsili.

2010-cu il 6 sentyabr tarixdə Azərbaycan Respublikası Nazirlər Kabinetinin 163 nömrəli qərarı ilə “Əlavə təhsilin məzmunu, təşkili və əlavə təhsilin hər hansı istiqaməti üzrə təhsil almış şəxslərə müvafiq sənədin verilməsi qaydası” təsdiq edilmişdir. Sənəddə aşağıdakılar qeyd edilir:

2.3.1. İxtisasartırma təhsilində dinləyicilərin biliklərinin, bacarıqlarının və peşəkarlıq səviyyələrinin, dünyagörüşlərinin müxtəlif istiqamətlərdə inkişaf etdirilməsi təlim modulları üzrə həyata keçirilir.

2.3.2. Modul ixtisasartırma təhsili prosesində nəzərdə tutulmuş müəyyən istiqamətdə bilik, bacarıq və vərdişlərin əldə edilməsinə, dünyagörüşün formalaşdırılmasına xidmət edən biliklər sistemini ifadə edir.

Yeni modelə əsasən ixtisasartırma təhsili proqramlarının 3 modul üzrə qurulması nəzərdə tutulur:

I Modul: təhsilin ümumi əsasları (pedaqoji, psixoloji məsələlər, təhsil sistemi, təhsilin əsasları, təhsilin idarə olunması, iqtisadiyyatı, maliyyələşməsi və digər məsələlər);

II Modul: ixtisas sahələri (ixtisas üzrə yeniliklər, yeni kurikulumun tətbiqi, tədris metodikaları, müasir təlim strategiyaları, nailiyyətlərin qiymətləndirilməsi məsələləri);

III Modul: təhsildə innovasiyalar və yeni tendensiyalar (İKT, xarici dil, inklüzivlik, gender və sair).

Modulun işlənilməsində ən mühüm cəhət onun məzmununun təqdim edilməsinin əyani və anlaşıqlı olmasıdır. Aydındır ki, modulun səmərəliliyi yalnız informasiyanın əhatəliliyindən deyil, həm də onun yığcamlılığından asılıdır.

Beləliklə, modul təliminin didaktik sistemi təlimin məqsədlərinə müvafiq olaraq məzmunun layihələndirilməsini nəzərdə tutur və ümumdidaktik prinsiplərə və meyarlara uyğun tərtib olunur. Modullar kompakt və əyani şəkildə təqdim edilir, həmçinin didaktik materiallarla təmin olunur.

Ənənəvi modeldən fərqli olaraq yeni modeldə dövlət təhsil müəssisələri ilə yanaşı, QHT-lər və özəl əlavə təhsil müəssisələri də prosesə cəlb edilməklə ixtisasartırma təhsili sahəsində rəqabət mühiti formalaşır. Peşəkar və səriştəli təlimçilər hazırlanır və komanda formalaşır. Müəllimlərə ixtisasartırma proqramlarının seçim imkanı yaradılır. Keyfiyyətin təmin edilməsi məqsədilə ixtisasartırma proqramlarının həyata keçirilməsi prosesi, onun nəticələri üzrə monitorinqlərin keçirilməsi və təhsilin nəticələrinin stimullaşdırılması nəzərdə tutulur. İxtisasartırma təhsili mümkün hallarda yerlərdə,

təhsil müəssisələrində həyata keçirilir. Tələbat və ehtiyacların öyrənilməsi təhsil müəssisələri, təhsili idarəetmə orqanları tərəfindən həyata keçirilir.

Qərarların icrası ilə əlaqədar olaraq əlavə təhsil haqqında hüquqi-normativ sənədlər öyrənilmiş, hər bir modul üzrə təkliflər, proqramlar, elmi məqalələr, metodik vəsaitlər hazırlanmış, AMİ və onun filiallarında, Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlanma İnstitutunda və əlavə təhsil mərkəzlərində xeyli işlər görülmüşdür.

• 2010-cu ildən başlayaraq ixtisasartırma təhsili sahəsində modul-kredit sisteminin tətbiqinə başlanmışdır.

• 2010-2012-ci illərdə 55 min müəllim (2008-2009-cu illər də daxil olmaqla 72 min) fənn kurikulumlarının tətbiqi üzrə məqsədli ixtisasartırmaya cəlb olunaraq II modul üzrə təlim kurslarından keçərək kredit toplamış və sertifikat almışlar.

• 2012-ci ilin noyabr ayından 2013-cü ilin fevral ayınadək 4 min ümumi təhsil müəssisəsi rəhbərləri, təhsil orqanları rəhbərləri və əməkdaşları "Fənn kurikulumlarının tətbiqinin idarəolunması" mövzusunda II modul üzrə təlim kurslarına cəlb olunmuşdur.

• 2013-cü ildən 50 min müəllimin fənn kurikulumlarının tətbiqi üzrə təlimlərə cəlb olunması üzrə təşkilati işlər həyata keçirilməkdədir.

• 2013-cü ildə məktəbəqədər təhsil kurikulumlarının tətbiqi ilə əlaqədar rəhbər və pedaqoji kadrlar ixtisasartırma təhsilinə cəlb edilməkdədirlər.

• Təhsil Nazirliyinin 18 aprel 2012-ci il tarixli 597 nömrəli əmri ilə "Məktəbəqədər, ümumi, ilk peşə-ixtisas və məktəbdənkənar təhsil müəssisələrinin rəhbər və pedaqoji kadrları üçün Kurikulum Çərçivəsi" və "İxtisasartırma təhsili proqramlarının qiymətləndirilməsi və tətbiqinə dair təlimat" təsdiq edilmişdir.

• Kurikulum çərçivəsində I və II modullara uyğun proqramların siyahısı, hər bir proqrama ayrılan saatların və müvafiq kreditlərin miqdarı göstərilmişdir.

• İnnovasiyalara aid III modul üzrə proqramlara ayrılan saatların və kreditlərin minimum həddi kurikulum çərçivəsində qeyd edilir, lakin proqramlar əlavə təhsil müəssisələri tərəfindən müstəqil olaraq müəyyənləşdirilir.

Bu görülən işlərə baxmayaraq problem kifayət qədər həllini tapa bilməmişdir. Bu sahədə dəqiqləşdirmə aparmaq, yeni struktur formalaşdırmağa ehtiyac duyulur.

2013-cü il 24 oktyabr tarixdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" haqqında sərəncam imzalanmışdır.

Azərbaycan Respublikası Nazirlər Kabineti bu sərəncama əsasən Fəaliyyət Planı hazırlamaqdadır. Təhsil müəssisələri, təhsillə bağlı olan QHT-lər, mütəxəssislər, müstəqil təhsil ekspertləri, ictimai qurumlar öz təkliflərini bu fəaliyyət planının hazırlanması üçün yaradılan işçi qrupuna təqdim etməkdədirlər.

Sərəncamda əlavə təhsilə də mühüm yer ayrılmışdır. Belə ki, sərəncamın dördüncü istiqamətində ömürboyu təhsili təmin edən infrastrukturun yaradılması, regional universal mərkəzlərin qurulması məsələləri ön plana çəkilir. Sərəncamın strateji istiqamətlər bölməsində (6.4), strateji hədəflər və tədbirlər bölməsində (7.2.1.2, 7.3.3.2., 7.4.) ömürboyu təhsilin səviyyəsinin artrılmasına diqqət yönəldilmişdir.

Bəzi hallarda müəllimlərin ixtisasartırma təhsilinə cəlb olunmasında köhnə, primitiv üsullardan istifadə olunur. Ancaq müəllimlərin dərslərini dinləməklə, məktəb rəhbərlərinin göstərişləri ilə müəllimləri ixtisasartırma təhsilinə cəlb etmək səmərəli

nəticələr vermir. Burada daha yüksək nəticə əldə etmək üçün yeni metodlardan istifadə etmək məqsədəuyğundur. Beynəlxalq təcrübələrə əsaslanaraq (Rusiya, Avstraliya, İtaliya) daha mükəmməl demokratik metodlara üstünlük verilməsi təhsilalanların da, təhsilverənlərin də ehtiyac və tələblərinin ödənilməsinə şərait yaradır. Müəllimlərin ixtisasartırma təhsilinə ya könüllü, öz istəkləri ilə, yaxud monitorinqlərin nəticəsinə əsasən cəlb edilməsi daha səmərəli nəticə verə bilər.

İxtisasartırma təhsilində I, II, III modulların kredit sisteminin tətbiqi zamanı daha optimal, variativ proqramlardan istifadə olunmalıdır. Fikrimizcə, ixtisasartırma təhsilində struktur dəyişikliklərinə yeni innovativ yanaşmalar pedaqoji ictimaiyyət arasında marağa səbəb ola bilər. Aşağıda belə bir innovasiyalı strukturun modelini sizə təqdim etmək istəyirik:

İxtisasartırma təhsilinin yeni infrastrukturunun yaradılması mexanizmi formalaşdırılmalıdır. Bu, müəllimlərin, təhsil işçilərinin, məktəbəqədər müəssisə tərbiyəçilərinin ixtisasartırma təhsilinin təşkili üçün innovasion strukturun bir variantıdır. Respublikanın ümumtəhsil məktəblərində fəaliyyət göstərən “Dayaq məntəqələri şəbəkəsi”nin formal xarakter daşıdığı və fəaliyyət göstərdiyi, innovativ təfəkkür təhsili ilə ayaqlaşa bilmədiyi, ictimai əsaslarla fəaliyyət göstərdiyi nəzərə alınaraq ləğv edilir. Rayon (şəhər) təhsil şöbələrində fəaliyyət göstərən Metodiki Mərkəzlər metodkabinetlərə çevrilir. Metodiki Mərkəzlərdə işləyən metodistlərin işi bu günün tələblərinə uyğun gəlmədiyinə, müasir baxımdan effekt vermədiyinə görə ixtisar edilir.

Təhsil şöbəsinin nəzdində Metodiki Mərkəz əvəzinə metodkabinet yaradılır və aşağıdakı ştatlar müəyyən edilir:

1. Müdir.
2. Laborant–operator.
3. Monitorinq və müəllim fəaliyyətinin qiymətləndirilməsi üzrə mütəxəssis.
4. Şagird, valideyn, ictimai qurumların münasibətlərini araşdıran sosioloq.

Metodkabinet müdiri–metodkabinetin ümumi işini təşkil edir. İşçilərinə rəhbərlik edir. Hər ay “Regional universal resurs mərkəzinə” kabinetin fəaliyyəti haqqında hesabatlar təqdim edir. Kabinet işçilərinin iştirakı ilə illik iş planı tərtib edilir və Rayon (şəhər) Təhsil şurasında müzakirəyə çıxarılaraq təsdiqinə nail olunur. Metodkabinet il ərzində plana uyğun şəkildə fəaliyyət göstərir.

Operator-laborant rayon (şəhər) ərazisində fəaliyyət göstərən müəllimlərin ixtisas üzrə məlumat bankını tərtib edir. Rayon (şəhər) ərazisində fənlər üzrə fəaliyyət göstərən müəllimlərin ixtisasartırmaya cəlbolunma ehtiyacları haqqında məlumatları metodkabinetin müdirinə təqdim edir.

Monitorinq və müəllim fəaliyyətinin qiymətləndirilməsi üzrə mütəxəssis plana uyğun olaraq rayon (şəhər) ərazisində müəllimlərin fəaliyyətinin monitorinqini aparır. Hər hansı bir ixtisas müəlliminin fəaliyyətinin qiymətləndirilməsi onun dərs dediyi şagirdlərin bilik və bacarıqlarının səviyyəsinin monitorinqi ilə müəyyənləşdirilir və metodkabinetə hesabatlar hazırlanır.

Şagird, valideyn və ictimai qurumların münasibətlərini araşdıran sosioloq rayon (şəhər) ərazisində fəaliyyət göstərən müəllimlərin dərs dediyi şagirdlərin (hər bir müəllim üçün ayrıca) sayını müəyyənləşdirir. Onlar arasında plana uyğun olaraq vaxtaşırı sosioloji sorğular keçirərək, şagirdlərin müəllimə münasibətini, ehtiyaclarını və arzularını aydınlaşdırır. Valideynlər arasında isə foks qrupları təşkil edir, söhbətlər aparır və valideyn-müəllim münasibətlərini öyrənir. Bütün bunlar haqqında metodkabinetin müdirinə hesabatlar verir.

Beləliklə, rayon (şəhər) təhsil şöbələrinin metodkabinetləri müəllimlərin daim

təkmilləşdirilməsi, ixtisaslarının artırılması, yeniləşdirilməsi, peşəkarlıq səviyyəsinin yüksəldilməsi, kommunikativ mədəniyyətinin formalaşdırılması məqsədi ilə sifarişlər hazırlayaraq "Regional universal resurs mərkəzləri"nə göndərir. "Regional universal resurs mərkəzləri" pedaqoji işçilər üçün ixtisasartırma təhsilini iki məqsədlə təşkil edir:

1. Karyeranın möhkəmləndirilməsi və yüksəldilməsi üçün lider təhsili.

2. İxtisasın artırılması və peşəkarlıq səviyyəsinin yüksəldilməsi təhsili.

Müəllimlərin, pedaqoji işçilərin, məktəbəqədər təhsil müəssisə tərbiyəçilərinin ixtisasartırma təhsilinə göndərilməsi iki yolla müəyyən edilir:

1. Müəllimin könüllü müraciəti əsasında.

2. Metodkabinetin ümumi rəyi əsasında.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli sərəncamının dördüncü istiqamətinə uyğun olaraq əlavə təhsil üzrə Təhsil Nazirliyinin tabeliyində olan müstəqil və bütün sahələri (pedaqoji, mədəniyyət, sənaye, kənd təsərrüfatı, səhiyyə, ticarət və s.) əhatə edən "Regional universal resurs mərkəzləri"nin yaradılması məqsədəmüvafiq sayıla bilər.

Lakin pedaqoji kadrlar, təhsil işçiləri, əsasən ümumtəhsil məktəblərin, liseylərin, məktəbəqədər təhsil müəssisələrinin əməkdaşları üçün regionlarda regional universal resurs mərkəzləri yaradıla bilər.

Yaradılmış regional universal resurs mərkəzində mərkəzin rəhbərliyi və iki şöbənin fəaliyyət göstərməsi məqsədəmüvafiq olardı.

1. Monitorinq və qiymətləndirmə şöbəsi.

2. Təhsilin təşkili şöbəsi.

Mərkəzin rəhbərliyi regiona daxil olan rayonların təhsil şöbələrinin metodkabinetləri ilə sıx əlaqədə fəaliyyət göstərərək, işin təşkili, idarə olunması və s. hallarda əlaqələr, işlər təşkil edə bilərlər.

Monitorinq və qiymətləndirmə şöbəsi təhsilə cəlb olunan müdavimlərin keçəcəyi təhsilin modulunu müəyyənləşdirib, dinləyicilərin ehtiyac və arzusu ilə proqram seçər, təlim başlanarkən diaqnostik qiymətləndirmə aparılar, təlimin sonunda yekun qiymətləndirmə vasitəsi ilə sertifikat verilməsi haqqında mərkəzin rəhbərliyinə təqdimat hazırlanar.

Təhsilin təşkili şöbəsi vaxtı, keçirilmə yerini, həcmi, proqramlarını müəyyənləşdirir. Ehtiyac olduqda tədrisin təşkili üçün əlavə mütəxəssislər də dəvət olunur. Təlimin bundan sonra keçirilməsinə ciddi nəzarət saxlanılır. Növbəti ixtisasartırma təhsilinin elanları hazırlanır və kütləvi informasiya vasitələrində onların dərcinə nail olunur.

Təqdim etdiyimiz model pedaqoji kadrların ixtisasartırma təhsilinə yeni yanaşmanın bir variantıdır. Burada Azərbaycan Respublikasının ümumtəhsil məktəblərinin və məktəbəqədər təhsil müəssisələrinin rəhbərləri, müəllimləri, tərbiyəçilərinin tələbləri, ehtiyacları nəzərə alınmalıdır. Milli və mənəvi dəyərlərimiz əsas götürülərək dünyanın bir çox dövlətlərinin (Rusiya, İtaliya, Avstraliya və b.) ixtisasartırma modellərindən istifadə edilməsi nəzərdən qaçırılmır.

*Rəyçi: prof. İ.Cəbrayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 06 sentyabr 2010-cu il tarixli 163 nömrəli qərarı ilə təsdiq edilmiş "Əlavə təhsilin məzmunu və təşkili Qaydası". // Təhsil xəbərləri, 2010, № 6, səh. 6-32.

2. Azərbaycan Respublikası Təhsil Nazirliyinin "İxtisasartırma təhsilinin kurikulum çərçivəsi və ixtisasartırma təhsili

proqramlarının qiymətləndirilməsinə dair təlimatın təsdiq edilməsi barədə" 18 aprel 2012 – ci il tarixli 597 nömrəli əmri. (Təhsil xəbərləri, 2012, № 5).

3. "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası. // Təhsil xəbərləri, 2012, № 6.

4. Ağamalıyev R. Pedaqoji kadrlar və onların diplomdansonrakı təhsil problemləri. // Azərbaycan müəllimi, 1998, № 48.

5. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Azərbaycan müəllimi, 2013, 25 oktyabr, № 41.

6. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı: Qanun, 2009.

**М.Ибадова,**
**Ш.Гарибов**

**Новые подходы к повышению квалификации педагогических кадров**

**Резюме**

В статье излагается современное состояние повышения квалификации педагогических кадров. Характеризуется модульная система образования. Подчеркивается необходимость разработки новых подходов к структуре повышения квалификации педагогических кадров. Авторы предлагают новую модель повышения квалификации учителей.

**M.Ibadova,**
**Sh.Garibov**

**Modern approaches to the improvement of professional skills of pedagogical cadres**

**Summary**

The article is dedicated to the qualification improvement of pedagogical staff. New module system of education is characterized. The author notes the necessity of elaboration of new approaches in order to improve the qualification of pedagogical staff, and offers a new model.

# YENİ MƏZMUN YENİ YANAŞMA TƏLƏB EDİR

**Zeynəb Məmmədova**
***Təhsil Problemləri İnstitutunun böyük elmi işçisi***

***Açar sözlər:*** *ümumi təhsil, məzmun standartları, təlim, kurikulum, inteqrasiya.*
***Ключевые слова:*** *общее образование, содержательные стандарты, учёба, курикулум, интеграция.*
***Key words:*** *secondary education, content standards, training, curriculum, integration.*

Azərbaycanın təhsil sistemində aparılan islahatlar dünya təhsil təcrübəsini öyrənməyə, müəyyən nəticələr çıxarmağa, təlim-tərbiyənin həyata keçirilməsi və bu prosesdə müəllimin roluna, şagird nailiyyətlərinin qiymətləndirilməsinə, tədris prosesində istifadə ediləcək üsul və vasitələrin seçilməsinə yeni baxış, müasir yanaşma tərzi formalaşdırır.

Ənənəvi təhsil sistemi şagirdlərin yaddaşlarına daha çox faktları, düsturları, anlayışları yükləməkdən ibarət olması ilə fərqlənir ki, bununla da uşaqlar həyatda rastlaşdıqları problemləri müstəqil həll etməkdə və əldə etdikləri informasiyaları sərbəst şəkildə həyata tətbiq etməkdə çətinlik çəkirlər.

Müasir şəraitdə milli dəyərlərimizi nəzərə almaqla Azərbaycanda təhsil sisteminin dünya təhsil sisteminə inteqrasiyası, aparılan şəxsiyyətyönümlü, nəticəyönümlü təhsilin gerçəkləşməsinə nail olmaq təhsil islahatlarının başlıca ideyasıdır.

Beynəlxalq təcrübələr göstərir ki, təhsil sistemində bu şəkildə islahatların aparılmasının böyük əhəmiyyəti vardır. Belə ki, təhsil işçilərinin qarşısında duran ən başlıca vəzifə nəticəyönümlü məktəb kurikulumunun lazımi şəkildə həyata keçirilməsidir.

Ümumi təhsilin dövlət standartları və proqramları (kurikulumları) hüquqi normativ sənəddir və təhsil sistemindən gözlənilən nəticələrin istiqamətini müəyyənləşdirir. Ümumi təhsil sistemində məzmunun nəticəyönümlü standartlar əsasında müəyyənləşdirilməsi istər hər bir təhsil pilləsi, istərsə də təhsil pillələri çərçivəsində tədris edilən fənlər üzrə ümumi təlim nəticələrinin reallaşdırılmasına imkan yaradır. Belə ki, şagirdlərin dünyagörüşünün, intellektual səviyyəsinin inkişafı onların şəxsiyyətinin formalaşmasına rəvac verir. Yəni əldə edilən biliklər əsasında formalaşan bacarıqlar şagirdlərin gələcək həyatlarının qurulması, cəmiyyətdə öz yerini tapmasını təmin etməlidir. Artıq V-VI siniflərdə kurikulumlar tətbiq olunur. Müəllimlər, şagirdlər və valideynlər üçün fizika fənninin VI sinifdən ümumi təhsilin dövlət standartları və proqramlarının (kurikulumlarının) tətbiqi ilə tədrisi maraqla qarşılanır.

Fizika fənninin tədrisi şagirdlərin maraq və meyillərinə uyğun olmaqla qarşılaşdıqları problemlərin həlli və müstəqil qərar qəbul etmələri üçün lazımi şərait yaradır. Dərsin ilkin mərhələsində motivasiyanın qoyuluşu xüsusi əhəmiyyət kəsb edir. Şagirdlərin idrakının fəallaşması dərsin motivasiya mərhələsində başlayır. Motivasiya məqsədəuyğun yaradılsa da həmin məqsəd fənnin məqsədindən kənara çıxmamalıdır. Ona görə də fizika fənninin də özünəməxsus məqsədləri həyatın tələb etdiyi zəruri bilik, bacarıq və vərdişlərin, eyni zamanda şagirdlərin şəxsi keyfiyyətlərinin formalaşmasına, on-

ların maraqlarının təmin olunmasına, təfəkkürünün yenilənməsinə istiqamətlənməlidir. Texnoloji təkamülün əsaslarından biri olan fizika elminin əsaslarının ümumtəhsil məktəblərində tədrisi şəxsiyyətin formalaşmasında müstəsna rol oynayır və zehni inkişafın bir vasitəsi kimi çıxış edir. Fizika fənninin tədrisi zamanı şagirdlərin elmi dünyagörüşünü, əqidəsini, yaradıcı bacarıqlarını inkişaf etdirməklə onlarda səliqəlilik, dözümlülük, tədqiqatçılıq, iradəlilik keyfiyyətləri formalaşdırır.

Ümumtəhsil məktəblərində fizika fənninin tədrisi qarşısında qoyulan məqsəd də ümumi təhsilin məqsədinə xidmət edir. Fizika elminin əsaslarına mükəmməl yiyələnmək, texnikanın əsaslarından baş çıxarmağa, cəmiyyətin tələbatına uyğun şagirdlərin ixtiraçılıq qabiliyyətini yüksəltməyə, sağlam gənc nəslin əxlaq, estetik və bədii tərbiyəsini inkişaf etdirməyə imkan verir.

Kurikulumun ənənəvi tədris proqramlarından əsas üstün cəhəti onun nəticəyönümlü olmasıdır. Fənnin təlimindən alınan nəticə əvvəlcədən müəyyənləşdirilir. Bu baxımdan VI sinfin sonunda şagirdin əldə edəcəyi bilik, bacarıq, vərdiş və dəyərlər aşağıdakı şəkildə müəyyənləşdirilmişdir.

Birinci ilin sonunda şagird fizika üzrə:

• hadisələri (mexaniki, istilik, elektrik) fərqləndirir, onlara dair sadə məsələlər həll edir;

• materiyanın formalarını fərqləndirir, maddələrin aqreqat hallarını izah edir və sadə məsələlər həll edir;

• təbiətdəki əlaqəli sistemləri fərqləndirir və qarşılıqlı təsirə dair müşahidələrini izah edir;

• sadə təcrübələr aparır və ölçü cihazlarından təhlükəsiz istifadə edir;

• fiziki hadisələrə əsaslanan məişət qurğularından istifadə edir;

• fizika elminin inkişafında dünya alimlərinin roluna dair məlumatları təqdim edir.

Hər bir fənnin məzmun xətti fənn üzrə ümumi təlim nəticələrinin reallaşmasını təmin etmək üçün müəyyənləşdirilmiş məzmunun zəruri hesab edilən tərkib hissəsidir.

Fizika fənn kurikulumunda 3 məzmun xətti var: fiziki hadisələr, qanunauyğunluqlar, qanunlar.

Bu məzmun xətti şagirdlərə mexaniki, istilik, elektromaqnit, işıq, atom və nüvə hadisələrini dərk etməyə, onları xarakterizə edən kəmiyyətlər arasındakı əlaqələrə dair məsələlər üzərində müstəqil işləmək fəaliyyətini və yaradıcılıq qabiliyyətlərini inkişaf etdirməyə imkan verir. Şagirdlərə müxtəlif mexaniki, atom və molekulların xaotik istilik hərəkəti, yüklü zərrəciklərin atom və nüvə daxili zərrəciklərin hərəkətlərinin qanun və qanunauyğunluqlarını mənimsəməyə şərait yaradır.

Tam orta təhsil səviyyəsində fundamental saxlanma qanunlarının köməyi ilə hadisənin, prosesin necə baş verməsinin qabaqcadan anlaşılması və tənzimlənməsində praktikada istifadəsinin əhəmiyyətini dərk etməyə imkan yaradır. Təbiətdə baş verən hadisələrin mahiyyətini şərh etməyə, onlardan həyati məqsədlər üçün istifadə etməyə, şagirdlərin tədqiqatçılıq meyilinin inkişafına zəmin yaradır.

Maddə və sahə, qarşılıqlı təsir, əlaqəli sistemlər.

Bu məzmun xətti materiyanın maddə və sahə formaları, onların vəhdəti və qarşılıqlı çevrilməsi, maddənin quruluşu, aqreqat halları, qravitasiya, elektromaqnit sahələri, fundamental qarşılıqlı təsirlərin (qravitasiya, elektromaqnit, güclü və zəif) maddələr arasında fiziki sahə vasitəsi ilə ötürülməsi əsaslandırılır, müxtəlif pillələrdə əlaqəli sistemlərin yaranmasında qarşılıqlı təsirin rolu göstərilir, təbiətin vəhdəti, kainatın yaranması, əlaqəli sistemlərin iyerarxiyası (pilləliyi) haqqında təsəvvürlər, həmçinin zaman və məkan anlayışları əsasında fəza təsəvvürləri formalaşdırılır. Bu təsəvvürlərin formalaşdırılması şagirdlərdə maddi aləmi dərk etmək, dünyanın vahid fiziki mənzərəsini təs-

vir etmək, məişət və istehsalatda istifadə üçün tələb olunan xassəli materialları seçmək və gündəlik həyatda onlardan istifadə etmək bacarıqlarının yaranmasına imkan verir.

Eksperimental fizika və müasir həyat məzmun xətti şagirdlərdə elmi-texniki tərəqqidə, cəmiyyətin sosial-iqtisadi inkişafında, digər təbiət fənlərinin öyrənilməsində fizikanın rolu haqqında təsəvvürlərin yaradılmasına, fiziki hadisə və prosesləri müşahidə etmək, onların elmi-nəzəri əsaslarını dərk etmək, alınan biliyi sistemləşdirmək və praktikaya tətbiq etmək bacarıq və vərdişlərini formalaşdırmaqla texniki yaradıcılıq qabiliyyətinin və tədqiqatçılıq meyilinin inkişafına zəmin yaradır.

Məzmun xəttinin köməyi ilə fiziki hadisələr müşahidə edilir, müxtəlif təcrübələr aparılır, müəyyən fiziki kəmiyyətlər təhlükəsizlik qaydalarına uyğun olaraq ölçülür, nəticələri cədvəl və qrafiklərdə təsvir edilir, kəmiyyətlər arasındakı qanunauyğunluqlar müəyyənləşdirilir, məişət və istehalatda istifadə olunan cihaz və avadanlıqların iş prinsipi öyrənilir, onlarda təhlükəsiz işləmək bacarıqları formalaşır.

Fizika fənn kurikulumunun məzmun standartları isə siniflər üzrə ümumi təlim nəticələrinin nəzəri və praktik əsasının reallaşdırılmasını tələb edir.

Məzmun xətlərinə uyğun VI sinif səviyyəsində fizika fənn kurikulumunda 5 əsas 14 alt standart vardır.

Kurikulumda məzmun standartları təlim məqsədlərini müəyyənləşdirir. Təlim məqsədlərinin müəyyənləşməsində şagirdlərin müstəqil fəaliyyətlərinə geniş yer verilməlidir. Müstəqil fəaliyyət zamanı sinif səviyyəsində qazanılacaq nəzəri biliklər və praktik bacarıqlar şagird şəxsiyyətini inkişaf etdirməlidir. Məsələn, VI sinifdə "1.1.1. Mexaniki, istilik, elektromaqnit hadisələrini fərqləndirir" alt standartının reallaşdırılmasında təlim fəaliyyəti prosesində şagirdlərin müşahidələr aparması, təcrübələrin qoyulması, ölçmə, alınmış nəticələrin təsvir və təhlili ön plana çəkilməlidir. Bu zaman şagirdlərdə mexaniki, istilik, elektromaqnit hadisələri haqda biliklər inkişaf etdirilir və bacarıqlar formalaşır. Təbiətdə və məişətdə rast gəldikləri müxtəlif hadisələri şərh etməyi bacarırlar. Eyni zamanda onlar həmin hadisələrə dair müşahidələr aparmaq və həmin hadisələri bir-birindən fərqləndirmək bacarıqlarına da yiyələnirlər. Belə ki, mexaniki hərəkəti öyrənən zaman şagird mexaniki hərəkəti növlərinə görə qruplaşdırma, təbiətdə və məişətdə rast gəldiyi müxtəlif hadisələri və onlara uyğun hərəkətləri əlaqələndirmə və bir-birindən fərqləndirmə, mexaniki hərəkətə aid sadə təcrübə aparma, müşahidəetmə və məntiqə əsaslanan sadə eksperimental, keyfiyyət və kəmiyyət xarakterli məsələlər həll etmə bacarıqları əldə edir.

İstilik hərəkətini öyrənən zaman şagird istilik hərəkətinin molekullararası qarşılıqlı təsirlər nəticəsində baş verməsi haqqında ilkin təsəvvürlərini şərh etmə, təbiətdə və məişətdə rast gəlinən istilik hərəkətləri haqqında müşahidələrini təqdim etmə, istilik hərəkətinə aid sadə təcrübələr aparma, müxtəlif tipli məsələlər həll etmə bacarıqları əldə edir.

Elektrik hərəkətini öyrənən zaman şagird yüklü zərrəciklərin qarşılıqlı təsirləri nəticəsində elektrik hərəkətinin baş verməsi haqqında ilkin təsəvvürlərini şərh etmə, elektrik cərəyanı, sadə elektrik dövrəsinə dair ilkin bilikləri təqdim etmə, elektrik cərəyanına aid sadə təcrübələr aparma, məsələ həll etmə bacarıqları əldə edirlər.

Şagirdlər apardıqları tədqiqatın nəzəri-idraki əsasını dərk etməli, müstəqil fəaliyyət nəticəsində təcrübə əldə etməlidirlər. Bu da ümumi təhsil pilləsinin dövlət standartları və proqramlarının (kurikulumlarının) tələbinin həyata keçirilməsinə imkan yaradır.

Həmçinin qeyd etmək istərdim ki, eksperimental metodlar şagirdlərdə müəyyən bacarıq və vərdişlər yaratmaqla onların təfəkkürünü fəallaşdırır, intellektual səviyyəni

yüksəldir.

Fizikanın öyrənilməsi şagirdlərin məntiqi təfəkkürünü formalaşdırmaq, mühakimə və dərk etmə qabiliyyətini yüksəltmək, nitqini inkişaf etdirmək üçün güclü vasitədir. Şagirdin nitqinin inkişafı təqdimat mərhələsində özünü büruzə verir.

Şagirdlər təbiət hadisələri ilə əlaqədar araşdırma apararkən onlarda müşahidələrə qiymət vermək bacarığı formalaşır.

Əsasən qruplarla iş onlarda şəxsi keyfiyyətlərin formalaşmasında mühüm rol oynayır. Belə ki, onlarda liderlik qabiliyyəti, əməkdaşlıq bacarığı formalaşır. Bu zaman unutmaq olmaz ki, şagirdlərdə fərdi iş zamanı müxtəlif qabiliyyətlər formalaşır. Yəni layihələr, təqdimatlar hazırlayan zaman onlarda fənnə uyğun olaraq xüsusi bacarıqlar formalaşır. Məsələn, şagirdlərdə eksperiment apararkən fiziki hadisəni dərindən mənimsəmək, fiziki hadisələr arasındakı əlaqəni izah etmək bacarığının inkişaf etdirilməsi ilə paralel nəticəni qabaqcadan duymaq, məntiqi nəticə çıxarmaq, proqnozlar vermək, fərziyyə və nəzəriyyələri eksperimentdə yoxlamaq qabiliyyətləri də inkişaf etdirilir. Şagirdlər hadisənin baş vermə, faktın, tərifin, qanunun yazılı və şifahi dildə düzgün şərhini verməklə nitqlərini inkişaf etdirirlər.

Beləliklə, ümumtəhsil məktəblərində fizika fənn kurikulumunun əsas məqsədi şagirdlərdə müstəqil tədqiqat aparmaq və problemi həll etmək kimi əsas bacarıqları, fəal mövqeyi, yaradıcı yanaşma tərzini, müstəqil olaraq təbiət və texnikanın mühüm qanunauyğunluqlarına aid elmi dünyagörüşü inkişaf etdirməklə, onlarda təfəkkür, kommunikativ mədəniyyətlər, müasir texnologiyalarla işləmək qabiliyyəti formalaşdırmaqdan ibarətdir.

*Rəyçi: Ə.Gərayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikası Nazirlər Kabinetinin "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)"nın təsdiq edilməsi barədə. Bakı şəhəri, 3 iyun 2010-cu il, №103.

2. "Azərbaycan Respubliksı ümumtəhsil məktəbləri üçün fizika fənni kurikulumu VI-XI siniflər" Layihə. "Azərbaycan müəllimi" qəzeti, 2010-cu il, 25 iyun.

3. Murquzov M., Abdurazaqov R., Əliyev R. Fizika. Ümumtəhsil məktəblərinin 6-cı sinfi üçün dərslik. Bakı, 2013.

4. Murquzov M., Abdurazaqov R., Əliyev R., Gərayev Ə., İsayev Z. Müəllim üçün metodik vəsait. Bakı, 2013.

**З.Мамедова**

**Новое содержание требует новый подход**

**Резюме**

В статье раскрывается основная сущность курикулума по физике, говорится о приобретеннии учениками при реализации стандартов, таких навыков как вести наблюдение, проводить опыты, измерение, анализировать и описывать полученные результаты и т.д., при проведении простых опытов и решении различных задач.

Из-за того, что предмет физика впервые изучается в 6 классе, демонстрируемые опыты и поставленные простые задачи, имеющие отношение к событиям в жизни, увеличивают интерес учеников к данному предмету.

**Z.Mammadova**

**New content demands new approach**

**Summary**

The article is dedicated to the implementation of curriculum on physics. It is noted that students acquire skills by observation, measurement, and analysis of the results which obtained conducting different experiments and solving different types of tasks.

Physical science is studied for the first time in the sixth grade and demonstrating experiments and simple issues which are related to life events increase the students' interests to the subject.

***Dilimiz-mənəviyyatımız***

# DİL XALQIN MİLLİ SƏRVƏTİDİR

**Buludxan Xəlilov**
***filologiya elmləri doktoru, professor***

Bəxtiyar Vahabzadə ana dilimizin təmizliyinə və gözəlliyinə riayət etməyi mənəvi zənginlik və kamillik kimi dəyərləndirir, təfəkkür mədəniyyətinin, intellektual qabiliyyətin yüksək göstəricisi kimi ön plana çəkir. Bəxtiyar Vahabzadəyə görə, dil xalqın malı və sərvətidir. O yazır: "Dil xalqındır. Ona görə də dilin gözəlliyi keşiyində yalnız alim və yazıçılar, filoloq və jurnalistlər deyil, bütün xalq durmalıdır. Bu, hər birimizin vətəndaşlıq borcudur. Bu, ümumxalq işi, dövlət işidir. Ata-babalarımızdan miras aldığımız ana dilimizi göz bəbəyimiz kimi qorumaq, onu cilalaya-cilalaya, öz dadı-tamı və təmizliyi ilə gələcək nəsillərə təhvil vermək müqəddəs borcumuzdur". (Dildə təbiilik və gözəllik. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.181)

Bəxtiyar Vahabzadə fikrin daha yığcam, dəqiq ifadə olunmasında dilin rolunu önə çəkir, dörd misralıq bir bayatını nümunə gətirməklə sözlərin fikrin çatdırılmasında daşıdığı məna yükünü izah edir.

Elim, günüm talandı,
Üstünə od qalandı.
Yad əlindən el köçdü,
Bir dağa daldalandı.

O, "Bir dağa daldalandı" misrası əsasında xalqdan gələn "El dağa daldalandı" misalının olduğunu deyir, eyni zamanda "daldalanmaq" sözünün etimologiyasına baş vurur. Bu sözün etimologiyası barədə yazır: "Daldalandı" sözünü açaq. "Dal" dilimizdə arxa mənasındadır. "Dal" kökündən yaranan "dalda" sözü kölgə, xəfə mənasında, "daldalanmaq" feli isə arxalanmaq, pənah gətirmək, sığınmaq mənasındadır. Beləliklə, kökə əlavə olunan şəkilçilərdən müxtəlif rənglər, çalarlar yaranmışdır. Söz ilkin mənasından çıxıb müxtəlif rənglər qazana-qazana gözəlləşmiş, şirələnmiş, əlvanlaşmışdır". (Dildə təbiilik və gözəllik. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik,1976, s.180)

Bəxtiyar Vahabzadə elmi yaradıcılığına Səməd Vurğunla başladığı kimi, dillə bağlı yazılarında da Səməd Vurğuna xüsusi diqqət göstərmişdir. 1956-cı ildə yazdığı "Mən ona borcluyam" məqaləsində onun elmi və bədii yaradıcılıq yollarında Səməd Vurğunun oynadığı rolu özü üçün müqəddəs bir borca çevirdi və bu barədə ürəyindən keçənləri səmimi şəkildə qələmə aldı. Səməd Vurğunla olan ilk görüşü barədə belə yazır: "Mən Böyük Vətən müharibəsi illərində ədəbiyyata gəlmişəm. Mənimlə bərabər bu dövrdə ədəbiyyata gələn onlarla gəncin bir şair kimi püxtələşib, yetişməsində ustad şairimiz Səməd Vurğunun böyük rolu olmuşdur. Hələ orta məktəbin 7-8-ci siniflərində oxuduğum zaman Səməd Vurğunla görüşmək, onunla söhbət etmək mənim ən böyük arzum idi. Bu arzuma mən birinci dəfə 1945-ci ildə nail ola bildim. O zaman "Ədəbiyyat qəzeti"ndə mənim "Yaşıl çəmən, ağac altı, bir də tünd çay" adlı şeirim dərc olunmuşdu. Ertəsi günü məni Yazıçılar İttifaqına çağırdılar. O zaman "Ədəbiyyat qəzeti"ndə işləyən şair Zeynal Cabbarzadə mənə dedi ki, Səməd Vurğun səni görmək istəyir (Səməd Vurğun Azərbaycan Sovet

Yazıçılar İttifaqının sədri idi). Bir qədərdən sonra Zeynal Cabbarzadə ilə bərabər onun otağına daxil olduq." (Mən ona borcluyam.- Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 65). Səməd Vurğun Bəxtiyar Vahabzadənin "Ədəbiyyat qəzeti"ndə çap olunmuş şeirlərinin məziyyətlərini təhlil etmiş, onu həvəsə gətirmiş, daha yaxşı yazmağa inam hissini aşılamışdır. Bəxtiyar Vahabzadə yazır: "O, (Səməd Vurğun - B.X.) "Ədəbiyyat qəzeti"ndə çap olunmuş şeirimi göstərib:

- Bu, çap olunmuş neçənci şeirindir?

- Doqquzuncu , - deyə cavab verdim.

O ayağa qalxıb:

- Yaxşı şeirdir, - dedi. - Yaxşılığı orasındadır ki, ritorikadan, ümumi sözçülükdən uzaqdır. Konkret bir lövhə çəkmisən.

Bundan sonra o bizə sənətin, şeirin bəzi sirlərindən danışdı. ...Ədəbiyyata gələn hər bir gəncdən yeni səs, yeni nəfəs tələb etdiyini təkidlə təkrar edirdi. O mənə də konkret lövhələr əsasında yazmağı, şablona, ritorikaya uymamağı məsləhət gördü" (Mən ona borcluyam. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik,1976, s. 66).

Bəxtiyar Vahabzadə Səməd Vurğunun onun yaradıcılığına çox həssas yanaşdığını, onun şeirləri üzərində qeydlər apardığını inkişafı üçün böyük fayda saymışdır. Hətta "Daşda bir ürək", "Axma, dur ey zaman", "Sarılığın hikməti" və sair şeirlərinin qüsurlu cəhətlərini tənqid etdiyini, misralar üzərində qeydlər apardığını onun yaradıcılığına "istiqamət verən bir mayak" hesab edir. (Mən ona borcluyam. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.66-67).

Bəxtiyar Vahabzadə Səməd Vurğundan sənətkarlığın, yaradıcılığın sirlərini öyrənmiş, "Səməd Vurğunun poeziyası" mövzusunda yazdığı elmi iş ona elmi dərəcədən başqa gələcək yaradıcılıq yolunu da müəyyənləşdirməkdə, yəni elmi yaradıcılıqla yox, şeir yaradıcılığı ilə məşğul olmasına yol açmışdır. Bu barədə oxuyuruq: "1947-ci ildə mən aspiranturaya daxil oldum. Mən "Səməd Vurğunun poeziyası" mövzusunda dissertasiya yazmağa başladım. Bu mövzu mənə yalnız elmi iş olmadı. Bu mövzunu işlərkən mən həm də bir şair kimi Səməd Vurğundan, onun sənətkarlıqla işlətdiyi ədəbi vasitələrdən sənətin sirlərini öyrəndim. Mən 1950-ci ildə dissertasiyamı tamamlayıb müdafiə etdim, elmi dərəcə aldım. Mən həmin əsərimdən bir nüsxə Səməd Vurğuna təqdim etdim. O özünün yaradıcılığı haqqında yazılan dissertasiyanı vərəqləyib mənə dedi:

- "Elmi işdir yazmısan, yaxşı eləmisən. Ancaq məncə sən şeirdə daha çox müvəffəq olursan. Sən bu yolla getməlisən." (Mən ona borcluyam. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik,1976, s.67). Beləliklə, Səməd Vurğunun bu məsləhəti ilə Bəxtiyar Vahabzadə şeirə, şeir yaradıcılığına üstünlük verir, dilin bədii imkanlarına, obrazlılığına daha çox diqqət göstərir. Nəticədə o, şeirdə uğurlar qazanır, eyni zamanda dilimizin imkanları ilə bağlı söylədiyi fikirlər dilçilik görüşləri kimi diqqəti cəlb edir. O təkcə şeirdə deyil, həm də dilimizin bədii imkanları ilə bağlı söylədiyi fikirlərində, dillə bağlı görüşlərində sənətkarlığını, peşəkarlığını təsdiq edir. Bu işdə Səməd Vurğundan öyrəndikləri heç də az deyil. O yazır: "Səməd Vurğun bizim şeirlərimizi oxuyarkən, xüsusən onun dilinə, dilin bədiilik və obrazlılığına çox diqqət yetirirdi" (Mən ona borcluyam. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.67). 1951-ci ildə yazdığı "Əbədi heykəl" poemasının Səməd Vurğun tərəfindən diqqətlə oxunduğunu, əsərin bir çox səhifələrində qeydlərin göstərildiyini onun sənətkar kimi formalaşmasına müsbət təsir göstərmişdir: O, bir çox misraların altından xətt çəkərək: "dilə fikir ver" sözlərini yazmışdır. Bəyəndiyi misraların yanında isə ya üç nida, ya "sağ ol", yaxud da "afərin" sözlərini yazmışdı. Həmin poemanı Səməd Vurğunun qeydləri əsasında yenidən işləyib çapa verdim və əsər haqqında tənqidimiz yaxşı fikirdə oldu" (Mən ona borcluyam. - Bəxtiyar Va-

habzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976. s. 67). Deməli, Səməd Vurğunun qeydləri, fikirləri Bəxtiyar Vahabzadənin təkcə şair kimi deyil, həm də dilin təəssübkeşi kimi formalaşmasında özünün qeyd etdiyi kimi" bizim (Bəxtiyar Vahabzadə nəzərdə tutulur - B.X.) inkişafımıza kömək etmişdir" (Mən ona borcluyam. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.67).

Bəxtiyar Vahabzadə Səməd Vurğunun məruzələrindən, alovlu şeirlərindən, qeydlərindən, söhbətlərindən yaradıcılığın nə demək olduğunu öyrənmiş, Mehdi Hüseynin ədəbi əsərlərindən, elmi-nəzəri səviyyəsi yüksək olan məqalələrindən, ədəbi döyüşlərdə fikir, ideya sahibi kimi seçilməyindən ədəbiyyat, sənət havası ilə nəfəs almağı, iradəli, təmkinli olmağı əxz etmiş və bununla da ədəbiyyatın, dilin keşikçisinə çevrilmişdi. Öz xalqının dilinin, tarixinin, ruhunun və mənəviyyatının keşikçisi olmuşdu. Xalqımızın ruhuna, mənəviyyatına, psixologiyasına dərindən bağlı olan ədiblərin, şairlərin yaradıcılığını təhlil etməsi, dil xüsusiyyətlərini araşdırması təsadüfi olmamışdır. Təsadüfi olmamışdır ona görə ki, onun özü də xalqa, onun dilinə, dəyərlərinə çox bağlı olmuşdur. Bu mənada 1957-ci ildə yazdığı "Ən böyük dayaq xalqdır" məqaləsində Mirzə İbrahimovun "Böyük dayaq" romanının dil və üslub xüsusiyyətlərindən bəhs etməsi xalqa bağlılıq hissinin ən bariz nümunəsidir. Hətta Mirzə İbrahimovun "Böyük dayaq" əsərindən gətirdiyi nümunə də bunu təsdiq edir: "Ey mənim xalqım, ey mənim ümidim və pənahım, ürəyimin istiliyi səndədir. Fikrim işığını səndən alır. Həyatımın hər yolunun sürüşkən döngələrində qolumdan tutan, məni yıxılmağa qoymayan sən olmusan. Gözəl binalar üçün mənə daş yonduran sənin eşqindir. Yolların kənarında ağac əkdirən, səhralara su gətirdən, yerin altını eşib sərvət tapdıran, çöllərdə məhsul yetirmək həvəsimi alovlandıran, qolumdan tutub "Yaz!" deyən sənsən. Alçaq əllər məni uçuruma itələyəndə dadıma sən çatmısan, amansız qorxu başımın üstünü alaraq məni ağır fikirlərə saldığı zaman, xoş günün dönük dostları, zəif və qorxaq yoldaşlar məndən üz döndərdiyi zaman yeganə dayanacağım sən olmusan" (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 42). Bu romanda Bəxtiyar Vahabzadənin diqqətini özünə çəkən cəhətlərdən biri elə yuxarıda qeyd olunan sözlərdə, həmin sözlərin məna və məzmunundadır. Bəxtiyar Vahabzadə yazır: "Bizcə, romanın adı da bu sözlərdən doğmuşdur və müəllif yuxarıda misal gətirdiyimiz sözlərlə oxucusuna demək istəyir ki, hər bir kəsin ən böyük dayağı tək-tək adamlar deyil, mənsub olduğu xalqdır. Vay o adamın halına ki, öz xalqından ayrı düşə, onun ruhuna, onun mənəviyyatına, dilinə və tarixinə biganə ola" (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 42).

Bəxtiyar Vahabzadəni "Böyük dayaq" əsərinin dilində cəlb edən cəhətlər nədir? Obrazların dilinin canlı, təbii, fərdi olması. Canlı danışıq dilindən düzgün istifadə olunması. Obrazların dilində atalar sözündən, məsəllərdən, idiomatik ifadələrdən gen-bol istifadə olunması. Eyni zamanda müəllifin dilinin də canlı, təbii və təmiz olması. Bəxtiyar Vahabzadə yazır: "Əsərin dilinə gəlincə demək lazımdır ki, M.İbrahimovun bu əsərinin dili başqa əsərlərinin dilindən daha canlı, daha təbii, daha gözəldir. Romanda obrazların dilində fərdiləşmə daha üstündür. Müəllif idiomatik ifadələrdən, el danışıq tərzindən, atalar sözlərindən, məsəllərdən, bir sözlə, canlı danışıq dilindən istifadə etmişdir" (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 54).

Bəxtiyar Vahabzadə müəllifin - Mirzə İbrahimovun öz dilində işlətdiyi idiomatik ifadələrə diqqətlə yanaşır, yazıçıların dilində çox az təsadüf olunan idiomatik ifadələrə izah verir. O yazır: "Müəllif bir yerdə "kəkliyim azıb" idiomatik ifadəsini işlətmişdir. Mən şəxsən bu sözə yazıçılarımızın dilində

çox az təsadüf etmişəm. Lakin bu ifadə el arasında işlənir. Bu, çox yeyəndən sonra soyuq dəyən adamın vəziyyətini, daha doğrusu, xəstələndiyini çox dürüst ifadə edən bir sözdür. Bu sözün yaxşılığı bir də orasındadır ki, xəstəliyin adı poetik ifadə olunmuşdur. (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 54-55).

Bəxtiyar Vahabzadə "Böyük dayaq" romanının dilindəki nöqsanlar barədə də qeydlərini söyləyir. Romanın dili fonunda Azərbaycan dilindəki sözlərin işlənmə imkanlarına, məna və məzmun gözəlliyinə münasibət bildirir. O, yerində işlənməyən sözləri nəzərdən keçirir, onların mətndəki və mətndənkənar mənalarına izah verir. Məsələn, "Son zamanlar Rüstəm kişi oğlunun tora düşməsindən, pis bir günah işləməsindən qorxurdu. 24 yaşlı canı-başı sağlam, istiqanlı bir oğlan özünü nə qədər saxlayacaqdı" cümləsindəki istiqanlı sözünə izah verərək yazır: "Sonuncu cümlədə "istiqanlı" sözü yerinə düşməmişdir. Çünki "istiqanlı" sözü canlı danışıq dilində mehriban, səmimi mənasında işlənir. Burada isə müəllif həmin sözü təxminən - "ehtiraslı" mənasında işlətmişdir" (Ən böyük dayaq xalqdır. - Bəx-tiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.55). Doğrudan da nəinki canlı danışıq dilində, eləcə də ədəbi dildə "istiqanlı" sözü "qanı isti olan" (məsələn, istiqanlı heyvanlar; Balina istiqanlı heyvandır) və məcazi mənada "çox ünsiyyətli, adamayovuşan, mehriban, üzügülər" (məsələn, istiqanlı uşaq; istiqanlı adam. - Əsasən çox istiqanlı olan bu gənc komandirlə soyuqqanlı danışırdı. Ə.Vəliyev) mənalarında işlənir. (Azərbaycan dilinin izahlı lüğəti. Dörd cilddə. 2-ci cild. Bak: Şərq-Qərb, 2006, s. 585) "İstiqanlı" sözündən yaranmış "istiqanlılıq" sözü "mehribanlıq, səmimilik, üzügülərlik", "coşqunluq, dəliqanlılıq" mənalarında (Azərbaycan dilinin izahlı lüğəti. Dörd cilddə. 2-ci cild. Bakı: Şərq-Qərb, 2006, s. 585) işlənir və təsdiq edir ki, "istiqanlı", "istiqanlılıq" sözləri "ehtiraslı" mənasını ehtiva edə bilmir.

Bəxtiyar Vahabzadə "Böyük dayaq" əsərindən çıxış edərək sözlərin, ifadələrin ən incə mənalarına, ifadə imkanlarına tələbkar mövqedən yanaşır, sözlərin, ifadələrin ruhunu duyur. Bu mənada "başın sağ olsun" ifadəsi ilə "canın sağ olsun" ifadəsini bir-birindən fərqləndirir. O yazır: "Əsərdə iki yerdə dilimizdə əzizi ölən adama təsəlli üçün deyilən "başın sağ olsun" ifadəsi "canın sağ olsun" şəklində işlənmişdir.

Ferma müdiri Rüstəm kişiyə belə deyir: "A Rüstəm, sən kolxoz sədrisən, hər ixtiyar sənin əlindədir. Sözü niyə havaya sovurursan? Yalandan akt eləmişəm, əlində material var, şübhəyə düşmüsən, qəmisiyə göndər, yoxlat. Düz çıxdı, ixtiyar sənin əlində, nə cəzam var ver. Yalan çıxar, başın sağ olsun" (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s. 55). "Başqa bir misal: Telli arvad Pərşana deyir: "Ay qızım, mənim nəyim var, dədən mənə neynəsin. Qulluğum yox, aşağı sala, əyri işim yox, başıma çırpa. Bir oğlumdur. Ferma müdiri, onu da özü qoyub. Xoşuna gəlməz özü də çıxardar. Sənin başın sağ olsun. Acından ölməyəcək ha" (Ən böyük dayaq xalqdır. - Bəxtiyar Vahabzadə. Sənətkar və zaman. Bakı: Gənclik, 1976, s.56). Göründüyü kimi, "başın sağ olsun" ifadəsi "canın sağ olsun" kimi işlənmişdir, bu da düzgün deyildir.

*Rəyçi: prof. N.Cəfərov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Vahabzadə B. Seçilmiş əsərləri, I-II cildlər. Bakı, 2004.

2. Vahabzadə B. Hər çiçəkdən bir ləçək. Bakı, 1982.

3. Qurbanov A. Müasir Azərbaycan dili. I cild. Bakı, 2003.

4. Xəlilov B. Dövlət dili həmişə taleyüklü məsələlərdən biri olmuşdur. // Azərbaycan məktəbi, 2013, № 3.

# AZƏRBAYCAN DİLİNİN TƏDRİSİNDƏ BƏZİ MƏQAMLAR

**Səfura Gözəlova, Suqra İmanova**
***Azərbaycan Dövlət Neft Akademiyasının baş müəllimləri***

***Açar sözlər:*** *türk dilləri, xarici dil, Dövlət Proqramı, milli təhsil.*
***Ключевые слова:*** *тюркские языки, иностранный язык, Государственная программа, национальное образование.*
***Key words:*** *turkish languages, forign language, state programme, national education.*

Dil ümumi mədəniyyətin göstəricisidir. Yalnız dil vasitəsilə xalqın mədəni səviyyəsini aydınlaşdırmaq, elmi terminləri nəzərə çatdırmaq olar. Məhz, bunlar nəzərə alınaraq Respublikamızın bütün ali məktəblərində, o cümlədən texniki ali məktəblərdə Azərbaycan dilinin elmi və praktik cəhətdən öyrənilməsinə böyük əhəmiyyət verilir. Dövlət dili olan Azərbaycan dili ümumtəhsil məktəblərindən başlayaraq bütün mərhələlərdə öyrənilir, tədris edilir, şagirdlərin, tələbələrin dilimizin incəliklərini mənimsəmələri həmişə ön cərgədə durur. Bunun nəticəsidir ki, hər bir təhsil ocağını qurtaranların bu dilin sirlərinə dərindən bələd olması qarşıya bir tələb kimi qoyulur. Yalnız bu yolla həm də xarici dillərin öyrənilməsinə yol açılır. İndi dünya ölkələrinin bir-birinə inteqrasiyası nəticəsində xalqlar bir-biri ilə genişmiqyaslı əlaqələrə, beynəlxalq əməkdaşlığa qoşulurlar. Ona görə də, burada dil amili mühüm əhəmiyyət kəsb edir. Bir və ya bir neçə xarici dili öyrənmək isə hər bir ziyalının mədəni səviyyəsinin kredosudur.

Ölkəmizdə Azərbaycan dili müstəqil Azərbaycan Respublikasının rəsmi dövlət dili statusu qazandıqdan sonra onun inkişafı üçün daha geniş münbit zəmin yaranmışdır. Bu da təbiidir, çünki dilimiz xalqın keçdiyi bütün mərhələlərdə onunla birgə olmuş, onun taleyini yaşamış, izlədiyi problemlərlə qarşılaşmışdır. O, xalqın ən ağır günlərində belə onun milli mənliyini, gələcəyə olan inamını qoruyub möhkəmləndirmişdir. Ulu öndərimiz Heydər Əliyev qeyd edirdi ki, “xalqımıza ulu babalardan miras qalan bu ən qiymətli milli sərvəti hər bir Azərbaycan övladı göz bəbəyi kimi qorumalı, daim qayğı ilə əhatə etməlidir. Bu, onun müqəddəs vətəndaşlıq borcudur”.

Bəli, ali məktəblərimizin istər Azərbaycan, istər rus, istərsə də digər bölmələrində Azərbaycan dilinin öyrədilməsi işi də həm müəllimlərin, həm də tələbələrin həyati tələbatı, vicdan borcu kimi qəbul edilir.

O da məlum həqiqətdir ki, hər kəsin vicdanı qarşısında onun hesabatı durmalıdır. Həm də hər kəs doğma dili sevərək mənimsəməlidir. Hər xalqın dili özü üçün əzizdir. Bu gün dünyada 3500-dən çox dil var. Buraya bir kökdən törəyən dillər-qohum dillər də daxildir. Belə dillərə bir dil ailəsi də deyilir. Obrazlı desək, qohum dillərin yaranması bir ağacın qol-budağa ayrılması kimidir. Məsələn, qədim ulu türk dili olan oğuz dili qıpçaq dili, qarluq dili, bulqar dili kimi dillərə (şaxələrə) ayrılır. Növbəti mərhələdə bu budaqlar da cavan qollara (dillərə) ayrılır. Tədqiqatlardan bəllidir ki, oğuz dilindən (budağından) türkmən dili, qaqauz dili, Azərbaycan dili və Türkiyə ləhcəsi törəyir. Bu dediklərimiz türk dilləri içərisində daha

aydın görünür.

Qeyd etmək lazımdır ki, heç zaman müxtəlif dillərə maraq indiki kimi olmamışdır. Qloballaşan dünyada bu sahədə gənclərin üzərinə böyük yük düşür. Ölkə rəhbəri tərəfindən təsdiq edilmiş “Azərbaycan gəncliyi 2011-2015-ci illərdə Dövlət Proqramı”nda gənclərin xaricdə təhsili də bu cəhətlə sıx bağlıdır.

Prezidentin milli təhsilimizin daha da inkişaf etdirilməsi məqsədi ilə imzaladığı iyirmiyə qədər Dövlət Proqramında, o cümlədən “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsili üzrə Dövlət Proqramı”nda bu sahənin aydın perspektivləri müəyyənləşdirilmişdir. Yeri gəlmişkən, həmin proqrama müvafiq olaraq hər il 500-dən yuxarı gənc xarici ölkələrin nüfuzlu universitetlərində təhsil alırlar. Proqram üzrə xarici ölkələrin ali təhsil ocaqlarına, hətta magistratura və doktorantura səviyyəsində də göndərişlər həyata keçirilir. Bütün səviyyələrdə bunların əsasında doğma Azərbaycanı bütün dünyada tanıtmaq, Azərbaycan dilini təbliğ etmək kimi böyük məqsəd dayanır.

Bir faktı yada salaq. 2013-cü ilin martında İtaliyanın paytaxtı Roma şəhərində “Xaricdə Təhsilalan və Məzun Olmuş Azərbaycanlı Gənclərin Beynəlxalq Forumu” (ASAIF) tərəfindən təşkil edilən “Azərbaycan 2020: gələcəyə baxış” milli inkişaf konsepsiyası ilə bağlı Forumun nəticələri bu baxımdan çox məhsuldar olmuşdur. Bu tədbirdə dünyanın 45 ölkəsindən gəlmiş 350 azərbaycanlı gənc, eləcə də, İtaliyanın aparıcı gənclər təşkilatlarını təmsil edən 20 gənc lider iştirak etmişdir. Forum çərçivəsində gənclər arasında fikir və təcrübə mübadiləsi aparılmış, gələcək əməkdaşlıq məsələləri müzakirə olunmuş və bir sıra memorandumlar imzalanmışdır. Belə tədbirlərdə Azərbaycan bayrağının dalğalanması və Azərbaycan sözünün tez-tez təkrar edilməsi milli-mənəvi dəyərlərin parlaq təzahürü təsiri kimi çıxış edir. Belə tədbirlər nəticəsində ölkəmizə və onun dilinə də maraq oyanır. Bu səviyyəli tədbirlər ölkəmizdəki ali məktəblərdə də keçirilir və bu tədbirlərdə Azərbaycan dilində məruzələr və çıxışlar səslənir.

Son illərdə Azərbaycanın dünya təhsilinə inteqrasiyası yeni çalarlara yol açmışdır. İndi Azərbaycan gəncləri təhsil almaq üçün həm də Şərqə üz tutmuşdur. Sadə bir misal, ötən il Çində 194 ölkədən 292,6 min xarici tələbənin təhsil alması bir sıra başqa ölkələr kimi Azərbaycana da öz təsirini göstərmişdir. İndi Çində azərbaycanlı tələbələr də təhsil alır. Hazırda 25 mindən artıq xarici tələbə Çin hökumətinin təqaüdünü alır. O da nəzərə çarpır ki, ötən il buraya oxumağa gələn xarici tələbələrin 64 faizi Asiya ölkələrinin payına düşür. Avropalı tələbələrin sayı 15 faiz təşkil edir. Buraya daha çox Cənubi Koreya, Tailand, Yaponiyadan tələbə axını var. Nazirliyin hesabatında qeyd olunur ki, 2020-ci ilə kimi Çin xaricdən 500 min tələbə cəlb etməyi nəzərdə tutub. Bundan ötrü hökumət təhsilin keyfiyyətini yüksəltməyi, ingilis dilində tədris proqramlarının sayını artırmağı, viza məhdudiyyətlərini azaltmağı və s. nəzərdə tutur. Deməli, azərbaycanlı gənclər də dünyanın bu böyük ölkəsinə üz tutmaq imkanı qazanmışdır: Azərbaycan dili Çində də səslənəcək.

Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 29 dekabr tarixli fərmanı ilə təsdiq olunmuş “Azərbaycan 2020: gələcəyə baxış İnkişaf Konsepsiyasında” Azərbaycan təhsilinin dünya və Avropa təhsil məkanına inteqrasiyası məqsədilə təhsil sahəsində beynəlxalq proqramlara qoşulmasının vacibliyindən bəhs edilərkən xaricdə təhsil də önə çəkilir. Orada deyilir: xarici ölkələrin aparıcı universitetlərində dövlət xətti ilə təhsil alan azərbaycanlı tələbələrin sayı 2015-ci ilədək əhəmiyyətli dərəcədə artacaq, xaricdə təhsil alaraq məzun olmuş mütəxəssislərin potensialından ölkənin inkişafında səmərəli isti-

fadə olunması təşkil ediləcəkdir və bunlar həm də 2015-2020-ci illər üçün gənclərin xarici ölkələrdə təhsil almasına dair Dövlət Proqramında öz ifadəsini tapacaqdır. Bütün bunların arxasında ilk növbədə dil problemi dayanır: özgə dili öyrənmək, öz dilini təbliğ etmək.

Azərbaycanda gənclərin xaricdə təhsilinə ardıcıl fikir verilir. Dünya təcrübəsində çox nadir hallarda dövlətin xaricdə təhsilalan həmvətənlərinin bütün təhsil və yaşayış xərclərini üzərinə götürməsi ilə rastlaşmaq olar. Azərbaycan Respublikası Prezidenti İlham Əliyev cənablarının bu məsələyə olan diqqəti və xüsusi münasibəti nəticəsində “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı” bunun bariz ifadəsidir. Möhtərəm Prezident bu proqrama start verməklə neft kapitalının insan kapitalına çevrilməsi siyasətini ortaya qoydu və ölkəmizin gələcəyinə ən yaxşı investisiya kimi bunun böyük bir inkişaf prosesinin başlanğıcı olduğunu təsdiq etdi.

Aydın məsələdir ki, azərbaycanlı tələbələrin xaricdə oxuması Azərbaycanın, onun mədəniyyətinin, dilinin təbliğ olunmasının ifadəsidir. Xarici tələbənin Azərbaycanda təhsil alması da bir mütəxəssisin Azərbaycan haqqında təsəvvürə malik olmasının daşıyıcısıdır.

Uzun illərin təcrübəsi göstərir ki, təhsilimizin dünya təhsil sisteminə inteqrasiya olunması və bu prosesin dünyəvilik aspektinə çevrilməsi günümüzün mühüm problemlərindən birinə çevrildiyi kimi, inkişaf etmiş ölkələrin təhsil ocaqları ilə aparılan əməkdaşlıq, gənclərimizin tanınmış ali məktəblərdə təhsil alıb vətənə savadlı kadr, mükəmməl mütəxəssis kimi dönmələrinə də rəvac vermişdir. Söz yox ki, dünya təhsilinə inteqrasiya Azərbaycanın dünyada daha çox tanınmasına səbəb olur və beləliklə, Azərbaycan dilinin əhatə dairəsi genişlənir.

Qeyd etmək lazımdır ki, 2000-ci ildən başlayaraq keçmiş SSRİ məkanında fəaliyyət göstərən ali texniki məktəblərlə əlaqələr də artıq bərpa edilmişdir. İndi ali məktəblərin beynəlxalq assosiasiyalara və digər təşkilatlara üzv olması beynəlxalq əlaqələrinin daha da zənginləşdirilməsinə səbəb olmuş, xarici ölkələr üçün mütəxəssis və elmi kadrların hazırlanması işi günün predmetinə çevrilmişdir.

Məsələn, ADNA-nın Almaniyanın Zigen Universiteti ilə işlənmiş birgə layihəsi əsasında tədris layihələri çərçivəsində konkret hallarda təhsilin ingilis dilində aparılması da mümkün sayılmışdır. ADNA ilk təhsil ocağıdır ki, bu universitetlə məzunlara birgə diplomlar verilməsi razılaşdırılmışdır. Fərəhli haldır ki, əvvəllər belə müqavilələr ancaq rus dilində bağlanırdısa, indi Azərbaycan dilində bağlanır və iki dildə imzalanır. Azərbaycan dili öz mövqeyini saxlayır və möhkəmləndirir.

Ümummilli liderimiz Heydər Əliyevin aşağıdakı sözləri bu sahədə görüləcək işlərin aydın proqramını vermişdir: “Xarici dil bilmək lazım və vacibdir. Gənclərimiz nə qədər çox dil bilsələr, bir o qədər zəngin dünyagörüşünə malik olacaqlar. Bu, müasir dünyanın tələbləridir. Amma ən əsası ondan ibarətdir ki, hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı öz ana dilini – Azərbaycan dilini, dövlət dilini mükəmməl bilməlidir”.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 23 may 2012-ci il tarixində imzaladığı “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair dövlət proqramı haqqında” sərəncamı ölkəmizdə dövlət dilimiz – Azərbaycan dilinin aktuallığını, əhəmiyyətini bir daha ortaya qoyur, hər bir soydaşımızdan ana dilinə münasibətində saygı və məsuliyyət tələb edir.

Göründüyü kimi, Azərbaycan dilinin

tədrisinə diqqət və qayğı ilə yanaşmaq kimi həssas məsələ bütün ali məktəblərin, o cümlədən texniki ali məktəblərin müvafiq kafedralarının üzərinə böyük məsuliyyət qoyur. Azərbaycan dilinin tədrisində əsas məqsəd odur ki, yetişməkdə olan müasir gənclik doğma ocağına, milli mədəniyyətinə, tarixinə, soykökünə qırılmaz tellərlə bağlansın. İndi dünyanın 20-dən çox ölkəsinin 200-ə yaxın aparıcı universitetlərində gənclərimiz tibb, mühəndislik, iqtisadiyyat və idarəetmə, informasiya və kommunikasiya texnologiyaları ixtisaslarına yiyələnirlər, söz yox ki, onlar həmin ölkələrdə Azərbaycan, Azərbaycan dili haqqında aydın təsəvvür yaradılmasına, ölkəmizin bütün dünyada tanınmasına öz töhfələrini verirlər. Xatırladırıq ki, yalnız 2012/13-cü tədris ilində 421 azərbaycanlı gənc xarici ölkələrdə təhsil almaq hüququ qazanmışdı. Onların sayı ildən-ilə çoxalır, deməli, informasiya bolluğu da ildən-ilə çoxalır.

Burada bir məsələyə də diqqət yetirilməlidir ki, bu tələbələr xarici ölkələrdə müvafiq dildə təhsil alarkən ana dilini mükəmməl bilməkləri onların köməyinə gəlir. Bir məsələni də xüsusi vurğulamaq lazımdır ki, ölkəmizin ali texniki məktəblərində xarici tələbələr də təhsil alır, ayrıca rus bölmələri vardır. Məsələn, Azərbaycan Dövlət Neft Akademiyasında bu sahədə uzunmüddətli ənənə yaranmışdır. Hələ 1961-ci ildə Azərbaycan Sənaye İnstitutunda əcnəbi tələbələrə rus dilini və ümumtəhsil fənlərinin tədrisini təşkil etmək üçün hazırlıq fakültələri yaradılmışdı. Hazırlıq fakültəsində rus dilini və ümumtəhsil fənlərini öyrənmiş tələbələr sonralar yalnız həmin institutda yox, SSRİ-nin digər rayonlarındakı ali təhsil müəssisələrində müxtəlif ixtisaslara yiyələnmək üçün təhsilini davam etdirirdilər. 1963-1969-cu illər ərzində institut Avropa, Asiya və Afrika ölkələrindən olan 200 nəfərə mühəndis, 14 nəfərə elmlər namizədi diplomu vermişdir. İnstitutun əcnəbi məzunları öz ölkələrinin ali təhsil müəssisələrində və elm mərkəzlərində yüksək vəzifələr tutmuşdular. Bu da Azərbaycanın təbliğində az əhəmiyyət kəsb etmir.

2000-ci ilə kimi ADNA-da dünyanın 70-ə yaxın ölkəsi üçün 3000-dən çox bakalavr, mühəndis, magistr, 300-ə qədər elmlər namizədi və elmlər doktoru hazırlanmışdır. ADNA-da təhsil alan əcnəbi əməkdaşlar elmi konfranslarda, idman yarışlarında, bəzi və s. tədbirlərdə yerli tələbələrlə bərabər hüquqi vətəndaş kimi iştirak etmişlər. Nabrandakı istirahət zonasında sağlamlıqlarını bərpa etmişlər. Bu faktlar bir daha bizim diqqətimizi ona cəlb edir ki, əcnəbi tələbələrin Azərbaycan dili ilə tanışlığı hər şeydə öz səmərəli nəticələrini verir.

Həm də tələbələrə aşılanmalıdır ki, danışıq zamanı sözlərin seçilib deyilməsinə, yumşaqlığına, ahənginə, vurğusuna fikir versinlər. Bu, həm də adamın mədəni səviyyəsindən xəbər verən ümdə məsələdir. Bu sahədə təhlükə ondan ibarətdir ki, məsələn, Azərbaycanda lap uşaqlıqdan rus və Azərbaycan dilini öyrənən şəxslər çox sözləri pis tələffüz edir, durğu işarələrini düzgün “qoymurlar”. Qeyd edək ki, ətraf mühit danışıq nitqinin mənimsənilməsinə mühüm təsir göstərir. Ona görə də, dilin öyrədilməsi zamanı bunlar nəzərə alınmalıdır.

Təsadüfi deyildir ki, Azərbaycan Respublikasının təhsil naziri tərəfindən “İngilis dilinin intensiv tədrisi üzrə layihənin əhatə dairəsinin genişləndirilməsi barədə” və “Rus dilinin intensiv tədrisi üzrə layihənin davam etdirilməsi barədə” əmrlər imzalanmışdır. Bu layihələrə əsasən məktəblərin konkret siyahısı da müəyyənləşdirilmişdir. Bütün bunlarda məqsəd birdir: dünya təhsilinə inteqrasiya dillərin öyrədilməsi vacibliyini zərurət kimi qarşıya qoyur. Söz yox ki, bütün bunlar Azərbaycan dilinin tədrisi ilə uzlaşdırılmalıdır. Aydındır ki, məhz bu yolla gənclər milli mədəniyyət nümunəsi kimi Azərbaycan dilini öyrənir, ona bələd olur,

elmi, bədii, publisistik və digər üslublarda yaradılan ədəbiyyat nümunələri ilə tanış olmaq imkanı qazanırlar.

Ona görə də, rus, ingilis bölmələrindəki Azərbaycan dili dərslərində dil haqqında məlumat veriləndə məsələyə daha geniş miqyasdan yanaşılmalıdır. Onlara bir daha izah edilməlidir ki, dil xalqın tarixi ilə üzvi surətdə əlaqədar olur, dili yaradan, onu tarix boyu qoruyub və inkişaf etdirən də xalqdır. Təsadüfi deyildir ki, Azərbaycan dilində gözəl bədii abidələr, ecazkar musiqi əsərləri yaradılmışdır.

Texniki fakültələrdə, o cümlədən rus qruplarında, əcnəbilərin təhsil aldığı qruplarda Azərbaycanın dünəni, bu günü və sabahı haqqında da ətraflı məlumat verilməsi həmişə öz müsbət nəticələrini verir. Dünyanın 87 ölkəsində bu dildə danışanlar vardır. Ümumiyyətlə, ana dili kimi Azərbaycan dilində 50 milyona qədər adam danışır. Bundan başqa, bəzi xalqlar arasında Azərbaycan dili ikinci ana dili kimi işlənir. Hazırda Azərbaycan ərazisində yaşayan bir sıra azsaylı xalqlar, o cümlədən ləzgilər, avarlar, saxurlar, talışlar, qırızlar və başqaları da Azərbaycan dilindən dövlət dili kimi istifadə edirlər.

Bir məsələni xatırlamaq yerinə düşər. Ümummilli lider Heydər Əliyev 1970-1987 - ci illərdə Azərbaycandan kənarda ali təhsil almış mütəxəssislərin ümumrespublika toplantısında (31 avqust 1998-ci il) bu məsələyə aydınlıq gətirmişdir. O demişdir: “Bir məsələ də vardır. Azərbaycanda təhsilalanların əksəriyyəti Azərbaycan dilində təhsil alır. Doğrudur, Azərbaycanda rus bölməsi də olmuşdur. Ancaq o vaxtlar bizə Sovetlər İttifaqı məkanında xalqımızı bu dövlətin hər yerinə daha da yaymaq və xalqımızın səviyyəsini artırmaq üçün rus dilində təhsil alan kadrlar da lazım idi. O illərdə Azərbaycandan kənara göndərilən tələbələrin hamısı, şübhəsiz ki, rus dilində təhsil alırdı”. Beləliklə də, biz doğma ana dilimizdəki təhsilə o vaxt çərçivəsində yaşadığımız Sovetlər İttifaqının hakim dili olan rus dilini birləşdirirdik. Bu da, təbiidir ki, respublikamızda bir çox sahələr üzrə Azərbaycan dilində ədəbiyyat, lazımi təhsil vasitələri yox idi. Bir çox elmi jurnalları, kitabları o vaxt yalnız rus dilində oxuyub öyrənmək mümkün idi. Azərbaycan artıq dövlət müstəqilliyini yaşayır. İndi vəziyyət dəyişmişdir. Azərbaycan dilinin öyrənilməsi, təbliği hər an nəzərdə tutulmalıdır.

Tələbələrə, xüsusən azərbaycanlı olmayanlara, rus bölməsində təhsilalanlara izah olunur ki, Azərbaycan dili öz mahiyyətinə görə indi dünyanın ən zəngin milli dillərindən biri sayılır. Bu dilin özünəməxsus gözəlliyi və ahəngi vardır. Azərbaycan dili, hər şeydən əvvəl, xoş avaz yaradan səslər sisteminə, zəngin və rəngarəng söz ehtiyatına, tam sabitlənmiş qrammatik qrupa malikdir. Bu dil elmi, siyasi, fəlsəfi fikirləri çox aydın ifadə etdiyi işi, bədii təfəkkürün gözəl nümunələrini yaratmağa qadirdir.

Eyni zamanda dünya mədəniyyəti xəzinəsinə qiymətli hədiyyələr kimi daxil olan Füzulinin “Leyli və Məcnun” poeması, Xətainin “Dəhnamə”si, Vaqifin qoşmaları, M.F.Axundovun komediyaları, C.Məmmədquluzadə və Ə.Haqverdiyevin duzlu-məzəli hekayələri, Sabirin satiraları, S.Vurğunun lirikası, Ü.Hacıbəyovun, Q.Qarayevin, F.Əmirovun klassik və milli musiqisi, bir çox digər sənət abidələri də məhz həmin dildə - Azərbaycan dilində yaranmışdır.

Azərbaycan dilinin gözəlliyi, onun zənginliyi və digər xüsusiyyətləri tarixin bir sıra görkəmli şəxsiyyətlərinin də nəzər-diqqətini özünə cəlb etmişdir.

Böyük rus şairi M.Y.Lermontov Azərbaycan dili haqqında demişdir: “Mən bir çox dağlar aşdım, Şuşa, Quba və Şamaxı şəhərlərində oldum... azərbaycanca öyrənməyə başladım, həmin dil burada və ümumiyyətlə, Asiyada, fransız dilinin Avropada olduğu

qədər zəruri bir dildir”.

Bu fikri N.Nərimanov isə belə ifadə etmişdir: “Firəng dili Avropada nə məqama haiz isə, bizim ana dilimiz Asiyada o məqama haizdir”.

Məşhur şəxsiyyətlərdən Bestujev Marlinski və başqaları da Azərbaycan dilinin əhəmiyyətindən bəhs etmişdir. Akademik Dorn, Lobaçevski Azərbaycan dilinə maraq göstərmişlər.

Hazırda ABŞ-da, həmçinin Qərbi Avropa ölkələrində (daha çox Almaniya, Danimarka, Hollandiya, Norveç, Fransa və b.) xeyli azərbaycanlı yaşayır. Onların çoxu İrandan gələnlərdir. Orta Asiyada da azərbaycanlılar məskunlaşmışdır. Onlar da dilimizi yaşadır, onun varlığını qoruyurlar.

Azərbaycan Respublikasında, İranda, Türkiyədə, İraqda, Gürcüstanda, Dağıstanda bu dildə danışırlar, yazırlar, oxuyurlar.

Məlumdur ki, beynəlxalq aləmdə ingilis dili, eləcə də fransız, alman, rus və s. dillər müasir dünyanın tarixən müəyyənləşmiş qüdrətli ünsiyyət vasitələridir. Xüsusilə ingilis dili son dövrlərdə aparıcı mövqedə durur. Təbiidir ki, Azərbaycan dili bu dillərlə rəqabətə girməkdən çox uzaqdır. Ona görə də, Azərbaycanda bu dillərin öyrənilməsinə də çox diqqət yetirilməlidir. Lakin xalqımız tərəfindən Azərbaycan dilinin tarixi hüquqlarının qorunmasına, onun nüfuzunun ölkə daxilində olduğu kimi, ölkə xaricində də yüksəlməsinə hər kəs diqqət və qayğı ilə yanaşmalıdır.

Yuxarıdakıları nəzərə alaraq, bir daha yada salırıq ki, texniki ali məktəblərin rus qruplarında, bir sıra ingilis dilli məşğələlərində Azərbaycan dilinin öyrənilməsi həmişə ön planda durmalıdır. Belə tələbələrdə Azərbaycan dilinə rəğbət oyatmaq üçün bədii əsərlərdən, söz sənətindən, musiqi dinləmələrindən istifadə edilməlidir. Onların diqqəti Azərbaycan dilindəki reklamlara cəlb edilməlidir. Son illərdə tərtib olunmuş lüğətlərdən geniş istifadə olunmalıdır. Bütün bunlar isə, ölkəmizdə Azərbaycan dilinin tədrisi ilə məşğul olan mütəxəssislərin məqsədinə, amalına çevrilməlidir. Azərbaycan dilinə münasibətdə həssas məqamlar hamı tərəfindən gözlənilməlidir.

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikası Prezidentinin “Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında” fərmanı. // Təhsil xəbərləri, 2001, № 1.

2. Ali məktəblərin rus qruplarında Azərbaycan dilinin tədrisinin bəzi məsələləri. // Azərbaycan məktəbi, 2013, № 5.

3. Ana dilimiz-milli qürurumuzdur. // Azərbaycan məktəbi, 2013, № 6.

4. Azərbaycan Prezidenti Heydər Əliyevin 1970-1987-ci illərdə Azərbaycandan kənarda ali təhsil almış mütəxəssislərin ümumrespublika toplantısındakı nitqi. 31 avqust 1998-ci il. Azərbaycan təhsil siyasəti. (1898-2004), I hissə, Bakı, 2005.

**С.Гёзалова,**
**С.Иманова**

**Некоторые моменты в преподавании азербайджанского языка**

**Резюме**

Преподавание азербайджанского языка в высших школах, в том числе в русских группах, является одним из щепетильных моментов учебного процесса Обучение азербайджанскому языку также способствует повышению его престижа.

**S.Gozalova,**
**S.Imanova**

**The few features of teaching Azerbaijan language**

**Summary**

In this article it is spoken about the main features of Azerbaijan language. The authors note the importance of teaching Azerbaijan language, especially in Russian groups. They regard it will enhance the influence of Azerbaijan language in the world.

# AZƏRBAYCAN TARİXİ VƏ ÜMUMİ TARİX DƏRSLƏRİNDƏ İKT-DƏN VƏ ƏLAVƏ MATERİALLARDAN İSTİFADƏ ETMƏKLƏ DƏRSİN TƏŞKİLİ

**Gültəkin Rüstəmova**
***S.Bəhlulzadə adına xarici dillər təmayüllü gimnaziyanın tarix müəllimi***

***Açar sözlər:*** *yeni təlim texnologiyaları, texnoloji inkişaf səviyyəsi, axtarış aparmaq, dərk etmək, tətbiq etmək, yaradıcı yanaşma, kurikulumun tətbiqi, ənənəvi dərs.*

***Ключевые слова:*** *новые технологии обучения, уровень технологического развития, проведение исследования, познать, применять, творческий подход, внедрение курикулума, традиционный урок.*

***Key words:*** *new training technologies, technological development level, conducting research, cognition, implementation, creative approach, applying curriculum, traditional lesson.*

Cəmiyyətimizin bütün sahələrində yeniliklərin tətbiq olunduğu bir dövrdə təhsilimiz də bu yeniliklərdən kənarda qalmır. Respublikamız müstəqillik qazandıqdan sonra dünya standartlarına cavab verən təhsil sisteminin qurulması, bu yolda dünya təcrübəsinə əsaslanan yeniliklərin tətbiq olunması bugünkü təhsilimizin təməlini təşkil edir. Yeni təlim texnologiyalarının məktəbə yol açması, fəal təlim metodlarının təlimdə yer alması şagirdlərin təfəkkürünü inkişaf etdirərək onlardakı passivliyi aradan qaldırır. Artıq şagirdlərdə sərbəst fikir formalaşdıraraq mühakimə yürütmək bacarıqları xeyli inkişaf edib. Tarix dərslərinin tədrisi zamanı daha çox şifahi nitqin formalaşması baxımından faktların səlist ifadə olunması, analiz edilərək hadisələrin inkişafının qiymətləndirilməsi şagirdlərin bir şəxsiyyət kimi formalaşmasında mühüm rol oynayır.

Bu günün müəllimi şagirdin marağını fənnin öyrənilməsinə yönəltmək üçün V–XI siniflərdə prezentasiyalardan geniş istifadə etməlidir. Bu cür yanaşma dərslərin ənənəvi üsulla tədrisindən uzaqlaşmaqla yanaşı, şagirdlərdə fərdilik və yaradıcı yanaşmanı da inkişaf etdirir. Prezentasiyaların hazırlanması ciddi və yaradıcı prosesdir. Orada hər element düşünülərək şagirdin qavraya biləcəyi tərzdə təqdim olunmalıdır. PowerPoint proqramı dərslərdə xəritələrin, rəsmlərin, tarixi şəxslərin portretlərinin, videofraqmentlərin, diaqramların təqdim edilməsinə, internet isə bu və ya digər məlumatların tapılıb istifadə edilməsinə imkan yaradır.

Bu imkanlardan yararlanaraq milli kurikulumun tətbiq edilmədiyi VII–XI siniflərdə ənənəvi dərs prosesində İKT-dən və interaktiv təlim metodlarından istifadə etməklə şagirdlərin dərsə marağını artırmaq olar.

Bir ənənəvi dərs zamanı şagirdlərimdən biri əl qaldıraraq bir təklifi olduğunu

söylədi. O, sərbəst şəkildə fikrini bildirərək dedi ki, " ... biz kitabdakı məlumatları elə özümüz də oxuyub öyrənə bilərik, yaxşısı budur ki, siz, kitabda olmayan məlumatları bizə deyin, ya da mənbə deyin, biz özümüz araşdırma–tədqiqat aparaq". Sinifdə fikir ayrılığı yarandı, bəziləri onunla razılaşdı, bəziləri yox. Hər iki tərəfə fikrini əsaslandırma imkanı yaradıldı, təbii ki, mütərəqqi fikir üstünlük qazandı.

Ümumilikdə götürdükdə, tarix fənni sirli, maraqlı faktlarla doludur. Sadəcə bir qədər vaxt sərf edib dərsin mövzusunu əhatə edən faktları əldə etmək, onları şagirdlərin diqqətinə çatdırmaq mövzunun mənimsənilməsinə müsbət təsir göstərir. Bu zaman şagirdlərin istəyini və hal-hazırkı texnoloji inkişafın istənilən məlumatı əldə etmək imkanını nəzərə alsaq, ənənəvi dərsləri müasir tələblərə cavab verə biləcək səviyyədə quraraq təlimin keyfiyyətini yüksəltmək olar.

Bütün fənlərdə olduğu kimi, tarix fənnində də hər bir mövzunun tədrisi özünəməxsus öyrətmə tərzi tələb edir. O cümlədən İKT-dən istifadə etməklə və əlavə materiallar əsasında mövzunun tam mənimsənilməsinə və şagirdlərin yaddaşına həkk olunmasına nail olmaq mümkündür. Məsələn, dərslər ənənəvi üsulla tədris edilərkən VI sinifdə Ümumi tarix fənnindən proqrama "Əhəmənilər dövləti" mövzusu yerləşdirilib. Mətnin sonunda dövlətin süqut olması yalnız bir cümlə ilə qeyd olunub. Burada Makedoniyalı İsgəndərin adı çəkilir və şagird televiziyada yayınlanan filmlərdə bu şəxsiyyət haqqında məlumatı olduğuna görə daha dəqiq məlumat istəyir. Orada göstərilirdi ki, "Əhəmənilər imperiyası III Daranın hakimiyyəti dövründə Makedoniyalı İsgəndərin Şərqə yürüşü nəticəsində e.ə 330-cu ildə süqut etdi". Niyə? Şagirdi bu sual düşündürür: Nə baş verdi? Hadisələrin inkişafı şagirdə maraqlıdır. Dərslikdə səbəb göstərilmir, deməli, səbəbi şagird özü axtarmalıdır. Sinifdə İKT-nin köməkliyi ilə axtarış verilir və şagirdlər cavabı müəyyən edirlər: "...E.ə.331-ci ilin yazında İsgəndər yenidən Asiyada göründü. Yunan-Makedoniya qoşunları Fərat və Dəclə çaylarını keçib Arbela yaxınlığında Qavqamela kəndinin ətrafında düşərgə saldılar. E.ə. 331-ci il oktyabrın 1-də burada İsgəndərin qoşunları ilə III Daranın qoşunları arasında üçüncü vuruşma oldu. Qavqamela vuruşması nəinki qədim dövrün ən iri vuruşmalarından biri, həm də makedoniyalı fatehin bütün vuruşmalarının ən çətini idi. III Daranın orduları darmadağın edildi. Şah bir neçə satrapla və kiçik bir qoşun dəstəsi ilə Madanın paytaxtı Ekbatanaya qaçdı… Əhəməni dövlətinin həyati əhəmiyyətə malik mərkəzlərinin hamısının yolu İsgəndərin üzünə açıldı. Persepoldakı şah sarayı yandırıldı. Lakin son dərəcə ağır təlafata baxmayaraq, III Dara hələ qisas almaq ümidində idi və Madada qoşun toplamağa başladı. III Dara İsgəndərlə mübarizəni məhz Madada davam etdirmək ümidində idi. O, Madada yeni qoşun toplamağa çalışırdı və bu işdə müəyyən uğurlar qazanmışdı. Lakin bir qədər sonra vəziyyət dəyişdi. Aydınlaşdı ki, kadusilər və skiflər III Daranın tərəfini saxlamırlar. Məhz buna görə III Dara Ekbatananı tərk edib monarxiyanın şərq əyalətlərinə qaçdı və tezliklə orada öz köməkçisi Bess tərəfindən öldürüldü." Dərsin gedişində İKT-dən istifadə etməklə qurulan dərsdə mövzuya aid əlavə faktların öyrənilməsi şagirdlərin yaddaşına həkk olunur: o dövrdə Əhəmənilər imperiyasının tərkibindəki xalqlar onlara edilən zülmün nəticəsində Əhəməni qoşununda vuruşmaqdan imtina edirlər.

Müasir dövrün inkişaf tempini nəzərə alaraq bu gün məktəbin qarşısında cəmiyyəti düşünən, yaradıcı tətbiqetməni bacaran, sərbəst fikir söyləməklə yanaşı onu əsaslandıran şəxsiyyətlər yetişdirmək vəzifəsi durur. Şagirdin 11 il ərzində əldə etdiyi bilik və

bacarıqlar, yaddaşına həkk olunmuş faktlar gələcəkdə harada olmasından asılı olmayaraq onun baza biliklərini təşkil edir. Müasir üsulla təşkil edilən dərs prosesində müəllim-şagird baryeri aradan qaldırılır. Belə bir şəraitdə tədris prosesində İKT–dən istifadə edən müəllimin şagirdlərlə münasibəti daha səmimi olur. Şagird belə müəllimi özünə daha yaxın bilir, onunla informasiya mübadiləsi edir, əlavə tədqiqat aparmaq üçün istiqamətin müəyyənləşdirməsini müzakirə edir, digərlərindən fərqlənmək və uğur qazanmaq üçün məsləhətlər alır. Belə işgüzar şərait onların bilik və bacarıqlarının inkişafı ilə yanaşı tədqiqat apararaq yeni faktları əldə edib, bunun üzərində fikir yürütmək bacarıqlarının yaranmasına da imkan verir. Müasir dərsin bu gün qarşımıza qoyduğu tələb şagirdə axtarış aparmaq, dərk etmək, tətbiq etmək və s. bacarıqları aşılamaqdır.

Yeni bilikləri şagirdlərə yalnız öyrətməklə kifayətlənmək olmaz. Öyrəndiklərini yadda saxlamaları üçün onlara uyğun şərait yaratmaq, xüsusən də tarix dərslərində maraqlı strategiyalar tətbiq etməklə verilən bilikləri möhkəmləndirmək daha faydalı olar. Məsələn: VIII sinif Azərbaycan tarixi proqramında “Azərbaycan Çobani və Cəlairilərin hakimiyyəti altında” adlı mövzu vardır. Bu mövzuda Məlik Əşrəfin Qızıl Orda xanı Canı bəy tərəfindən taxtdan salınmasından bəhs edilir. Dərslikdə Məlik Əşrəfin edam olunduğu yazılır. Amma hadisələrin necə cərəyan etməsi, təbii ki, açıqlanmır (əgər hər baş verən hadisənin açıqlanması və izahı salnamələrdə verildiyi kimi açıq şəkildə yazılsa, mövzu çox böyük alınar ki, bu da şagirdin qavraması üçün çətinlik törədər ). Bu mövzunu tədris edərkən Vaqif Piriyevin “Azərbaycan XIII–XIV əsrlərdə” adlı kitabından bir mənbə kimi istifadə edərək, oradakı salnamələrdə əks olunmuş edam səhnəsini şagirdlərin nəzərinə çatdırmaq şagirdlərdə böyük maraq doğurar. Bu zaman şagirdlər dəqiq öyrənirlər ki, Məlik Əşrəf Canı bəy tərəfindən edam edilməyib. Çünki mənbədə yazılır: “...Canı bəy Məlik Əşrəfi öldürmək fikrində deyildi, onu öz ölkəsinə (Qızıl Ordaya) aparmaq istəyirdi. Lakin Şirvanşah Kavus, Qazi Məhiyyəddin Bərdəyi və başqa yerli feodallar bildirirlər ki, Əşrəf öldürülməsə əhali mübarizədən əl çəkməz və iğtişaş baş verər. Canı bəy fikrindən dönür və Əşrəfi onların sərəncamına verir. Məlik Əşrəf edam olunmaq üçün meydana gətirilir. Yolda təbrizlilər onu cəlladın əlindən alır, atdan çəkib yerə atırlar, böyrünə xəncər sancırlar. Əşrəfin edam mərasimi təbrizlilərin şadlıq bayramına çevrilir. Əhali dəstə-dəstə Marağalılar məscidinə tərəf axışır və Əşrəfin asılmış başına lənətlər yağdırırdılar” (2, səh. 156). Hadisələrin salnamələrdə əks olunmuş təsviri şagirdlərin yaddaşından silinməyəcək, Hülakülər dövlətinin süqutunu həmişə dəqiqliklə yadda saxlayacaqlar. Burada şagirdin diqqəti faktların dəqiqliyinə, yəni əslində Məlik Əşrəfin ölümü və bununla da Hülakülər dövlətinin süqutunun hansı şəraitdə baş verməsinə yönəldilir. Baxmayaraq ki, Məlik Əşrəf Hülakü nəslinin nümayəndəsi deyildi, amma onun ölümü ilə dövlətin də faktiki varlığına son qoyuldu. Bu fakt şagirdlərin diqqətinə çatdırılmaqla əqli nəticə əldə edilir.

Təcrübə göstərir ki, dərsdə müxtəlif təlim üsullarından istifadə etmək, İKT-dən əldə edilən məlumatlarla yanaşı müxtəlif ədəbiyyatlarla da işləmək təlimin keyfiyyətinin yüksəldilməsinə xidmət edir, şagirdlərin fəallığını artırır. Onların bu fəallığını daha da artırmaq məqsədilə növbəti dərslərin gedişində araşdırmanın aparılmasını şagirdlərin özlərinə həvalə etmək təlimin səmərəliliyini daha da artırır. Hər dəfə yeni məlumat müəllim tərəfindən təqdim edilərsə, şagirdlərin araşdırma aparmaq bacarığı inkişaf edə bilməz. Odur ki, sinfə müraciət edərək ev tapşırığında “Keçilən mövzu ilə

əlaqədar daha maraqlı və fərqli məlumatlar əldə etməklə kim təqdimat hazırlaya bilər?" - deyə müraciət etdikdə, şagirdlər arasında elmi rəqabət yaranır. Gələn dəfə üçün hər kəs elə bir təqdimat nümayiş etmək istəyir ki, fərqli və maraqlı olsun. Bununla da şagirdin fənnə olan marağı və istəyi daha da artmış olur. Yaradıcı yanaşmanı inkişaf etdirmək məqsədi ilə şagirdlərə prezentasiyaların hazırlanması, vebsaytların yaradılması, elektron testlərdə biliklərini sınamaq kimi metodlar təklif edilir. Bu zaman şagirdlər bir-birindən fərqli individual olaraq işlər təqdim etməyə çalışır, bu isə onlarda fənnə olan marağı daha da artırır.

Şagirdlər yarışmanı sevir, ona görə də onlara bir yarışma elan edib, təqdim edəcəkləri işləri də elə məhz özlərinin qiymətləndirməsini həvalə etməklə təlim prosesini bir qədər də canlandırmaq olar. Təqdimatları ya qruplar şəklində, ya da individual olaraq təqdim edə bilərlər. Əsas odur ki, dəqiq faktlara söykənən, ətraflı, fərqli bir iş olsun. İndiki nəsil kompyuterlə işləmək bacarığına görə özündən əvvəlki nəsilləri çox geridə qoyub. Bəs niyə onların bu bacarıqlarını təlimə yönəltməyək? Şagird kompyuter biliklərindən təlimin bir çox mərhələlərində istifadə edə bilər:

1. Yeni materialların izah olunmasında;

2. Aldığı məlumatların möhkəmləndirilməsində;

3. Təkrar edərkən (onlayn testlər və s.);

4. Kiçik və böyük summativ qiymətləndirmələrdə. Bu vaxt şagird müxtəlif funksiyalar yerinə yetirmiş olur:

• Kollektiv əməkdaşlıq;

• Oyun şəklində dərsin mənimsənilməsi;

• Bir-birini dinləmə bacarığına yiyələnmək;

• Qiymətləndirilmədə şəffaflığa alışmaq;

Kompyuterdən istifadə etməklə şagird:

1. Müəllimin köməyi olmadan informasiya əldə edə bilir;

2. Multimediadan istifadə etməklə sərbəst iş yaradır;

3. Fərdi informasiya mühitinə sahib olur;

4. Biliyinin möhkəmləndirilməsi üçün məşq edir;

5. Özünü qiymətləndirməyi bacarır.

Məlumdur ki, kurikulumun tətbiqi bu dərs ilindən (2013/2014) VI sinifləri əhatə edir. VII–XI siniflərdə oxuyan şagirdlərin kurikulum sistemində dərs keçmək kimi bir vərdişləri olmadığından, onlar üçün bir növ ənənəvi dərs və müasir dərsin vəhdətini təşkil edən dərs prosesinin təşkili məqsədəuyğundur. Doğrudur, onlarda müasir dərs vərdişi ibtidai siniflərdən formalaşmayıb, amma bugünkü şagirdlərin kompyuter biliklərini nəzərə alaraq müasir dərs sistemini onlara da tətbiq etmək olar. Plutarx deyib: "Şagird qab deyil ki, onu doldurasan, o məşəldir, onu yandırmaq lazımdır". Müasir təlimə keçid dövründə bu şagirdləri kənara qoyub onlarla yalnız ənənəvi üsulda dərs keçməklə biz onları "itirmiş" olarıq. Amma əksinə müasir üsulları onlara da tətbiq etdikdə bəhrəsi qənaətbəxş olur. Bu cür dərs prosesində sinifdə passiv şagirdlər belə diskussiyada iştirak etməyə can atır, dəyərli fakt söyləyə bilməsi üçün araşdırma aparır. Bunu şagirdlərin dərsə münasibətində açıq-aydın görmək mümkündür, irəliləyiş varsa inkişaf da vardır.

Məqalənin elmi yeniliyi ondan ibarətdir ki, müəllif tarix dərslərində VII-XI sinif şagirdlərini tədqiqata cəlb etməklə İKT-dən əlavə digər yazılı mənbələrdən istifadə etməklə şagirdlərin yaradıcılıq, axtarış, təfəkkür qabiliyyətlərinin inkişafına təkan verən üsulları şərh etmişdir.

Məqalənin praktik əhəmiyyəti və tətbiqi. Məqalədə irəli sürülən müddəalarda

göstərilən təlim üsullarından yuxarı siniflərdə dərs deyən tarix və digər humanitar fənn müəllimləri faydalana bilər.

Nəticə etibarilə qeyd etməliyik ki, istər kurikulum tətbiq edilən siniflərdə, istərsə də VII-XI siniflərdə keçirilən ənənəvi dərslər zamanı İKT və yeni təlim metodlarından istifadə etməklə təlim keyfiyyətini artırmaq olar.

*Rəyçi: tarix üzrə fəlsəfə doktoru N.Əliyev*

**İstifadə edilmiş ədəbiyyat**


1. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları) // Azərbaycan məktəbi, 2011, № 6.
2. Əliyev V., Babayev İ., Məmmədova A. Ümumi tarix. Bakı: Aspoliqraf, 2013.
3.. Piriyev V. Azərbaycan XIII-XIV əsrlərdə. Bakı: Nurlan, 2003.
4. Sadıqov F. Pedaqogika. Bakı: Biznes Universiteti, 2006.
5. Paşayev Ə., Rüstəmov F. Pedaqogika. Bakı: Çaşıoğlu. 2002.


**Г.Рустамова**

**Организация уроков по истории Азербайджана и всеобщей истории с применением ИКТ и дополнительных материалов**

**Резюме**

В статье автор отмечает, что внедрение новых технологий обучения, использование методов интерактивного обучения, развивает мыслительную деятельность учащихся. У них формируется способность самостоятельно пополнять свои знания, проводить исследования. Далее автор отмечает большую роль презентаций, которую можно проводить в 5 - 7 - х классах при изучении истории. Для этого используются как ИКТ, так и дополнительные материалы, разные источники.

**G.Rustamova**

**Organisation Azerbaijan history and world history lessons using ICT and additional materials**

**Summary**

The author notes that introduction of new learning technologies, using interactive methods helps to develop cognitive activities of students. Students form their own ability to improve their knowledge, to conduct research. The author further notes the important role of presentations, which can be done in 5 - 7 classes in the study of history, using ICT as well as additional material from many sources.

# İNTEQRASİYA BÜTÜN SİNİFLƏRDƏ VACİBDİR

**Emiliya Kərimova**
***Azərbaycan Müəllimlər İnstitutunun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *inteqrasiya, inteqral prinsip, ana dili, kurikulum, diferensiasiya.*
***Ключевые слова:*** *интеграция, интегральный принцип, родной язык, учебный план, дифференциация.*
***Key words:*** *integration, integral principle, mother tongue, curriculum, differentiation.*

Bu gün inteqrasiya prosesinə sosial idrakın ümumi metodologiyası müstəvisində baxılmalıdır. İnteqrasiya ideyası biliklərin məzmununun seçilməsinə yeni yanaşma tələb edir: fənlərin inteqrasiyası əhəmiyyətli dərəcədə vaxt ehtiyatına qənaət deməkdir. Bu vaxt yalnız biliklərin dərindən öyrənilməsi üçün deyil, həm də biliklərin keyfiyyətcə yeni səviyyədə mənimsənilməsinə sərf edilə bilər. İnteqrativ proseslər biliyin bütövlükdə cəmiyyətin inkişafını müəyyənləşdirən aparıcı qüvvə kimi real üstünlüyünü təmin etməyə qabildir. Kompleks inteqral prinsip dünyanın mənzərəsini və cəmiyyətin həyatını bütün tamlığı ilə şagirdlərə göstərir.

Təhsildə inteqrasiya nəticə etibarilə yeni elm sahəsi formalaşdırır. İnteqrasiya sosial–iqtisadi şəraiti dəyişən, təhsil sistemini inkişaf etdirən yeni konsepsiyanın əsası kimi çıxış edir.

İnteqrasiya tərbiyə prosesində heç də təlim prosesindəkindən az əhəmiyyət kəsb etmir. Biz adətən, tərbiyənin ayrı–ayrı sahələri üzrə tədqiqat aparırıq: “Kiçikyaşlı məktəblilərin şüurlu intizam tərbiyəsi”, “...düzlük və doğruçuluq tərbiyəsi”, “... məsuliyyətlilik tərbiyəsi”, “...nəzarətlilik tərbiyəsi” və s. bu qəbildən olan namizədlik dissertasiyalarında tərbiyənin sahələri arasında vəhdət nəzərdən qaçırılır. Mövzunun vurğunu olan, onu ideal hesab edən tədqiqatçı şagirdin bütün vaxt büdcəsini, enerjisini həmin sahəyə yönəltmələrini tələb edir. Belə olduqda bütövlükdə insani keyfiyyətlərlə formalaşan şəxsiyyətin, əsl insanın yetişdirilməsi unudulur. Tərbiyədə kompleks yanaşma ideyası məhz insanı mənəvi cəhətdən saf, hərtərəfli inkişaf etmiş əsl vətəndaş kimi formalaşdırmaq üçün tərbiyə anlayışına daxil olan bütün komponentlərin vəhdətdə görülməsini–inteqrasiyasını tələb edir. Adətən, təlim prosesində müəllim proqram materiallarını şərh edir, şagirdə ev tapşırığı verir.

Şəxsiyyətin tam, bütöv varlıq olması, onun bütövlükdə bir insan kimi qiymətləndirilməsi vacibdir. Yaxşı musiqişünas, idmançı, rəssam, alim olmaq asandır, insan olmaq isə çətin. Biz əsl insan tərbiyə etməliyik. İnteqrasiya məhz bu prosesdə baş verir. Şagirdlərin mənimsədikləri idraki və bədii ictimai təcrübə, pedaqoji prosesdə formalaşdırılan şagird şəxsiyyəti də inteqral xarakter daşıyır.

İnteqrasiya həm də böyük sosial əhəmiyyət kəsb edir. Təhsilin ibtidai mərhələsində keçirilən bayramlar, kütləvi tədbirlər siniflər arasında yaxınlaşmanı təmin edir. Bu tədbirlərin bəzən məktəbin ümumi tədbilərinin tərkib hissəsi olması kiçikyaşlı məktəblilərin yuxarı sinif şagirdləri arasında qaynayıb-qarışması, məktəbin şagird kollektivinin formalaşması ilə nəticələnir. Respublikanın bütün şəhər (rayon) məktəbləri arasındakı belə əlaqələr vahid məxrəcə gəlmə, inteqra-

* 6

siya, yeni nəslin, yeni bir cəmiyyətin formalaşmasına zəmin yaradır.

İnteqrativ təlim heç də yeni şey deyil. Məgər müəllimlərimiz indiyədək inteqrasiyadan istifadə etməmişlər? Elə bir fənn (hətta mövzu) tapılarmı ki, onu digər fənlərdən (mövzulardan) təcrid edilmiş halda tədris etmək mümkün olsun? İnteraktiv təlim tarixən ibtidai təlimdə özünə yer tapmışdır. Görünür, bütün fənlər bir müəllim tərəfindən tədris edildiyindən ibtidai siniflərdə fənlərin inteqrasiyası daha təbiidir. Bu mərhələdə dnd dili fənni öz təbiəri etibarilə inteqrativdir. Deməli, təbii inteqrasiyanın ünvanı ibtidai təlimdir. A. Disterverqin, Y.A.Komenskinin ibtidai təlimin təbiət–varislik (təbiətəuyğunluq) prinsipi əsasında təşkili ideyası bunu bir daha sübut edir. K.D.Uşinskinin “Rodnoe slova”, “Detskiy mir” dərsliklərinə ədəbi əsərlərdən əlavə təbiətşünaslıq, coğrafiya və vətən tarixinə aid çoxlu mətn daxil edilmişdi. ibtidai təlimin şifahi metoduna böyük üstünlük verən K.D.Uşinski ətraf aləm, hər şeydən əvvəl, təbiət obyektləri və hadisələri üzərində müşahidəni uşaqların əqlinin və qəlbinin inkişafı üçün ən yaxşı material hesab edirdi. Sosial və təbiət aləminin qarşılıqlı əlaqədə dərk olunması pedaqoqları, fizioloqları çoxdan düşündürmüş və aləmşünaslıq inteqral kursunda öz əksini tapmışdır.

İbtidai siniflərdə nitq inkişafı ana dili tədrisinin başlıca prinsipidir. “Azərbaycan dili” kursunun nitqyönümlü olması, yəni tədris prosesində üstünlüyün qrammatik, orfoqrafik qaydaların öyrənilməsinə, nəzəriyyəyə deyil, praktik cəhətə - nitq inkişafına verilməsi inteqrasiya üçün əlverişli şərait yaradır. Məlumdur ki, nitq fəaliyyəti olmadan heç bir dərsin quruluşu mümkün deyil. Şifahi nitqin inkişafı üzrə məşğələ eşitmə, danışma və oxuma kimi nitq fəaliyyətlərini də birləşdirir. Eyni zamanda fənlərin inteqrasiyası öz-özlüyündə məqsəd ola bilməz. İnteqrasiyanın məqsədi fənlərin qarşılıqlı təsir nəticəsində bir–birini zənginləşdirməsidir. Ana dilinin digər fənlərlə inteqrasiyasının təbii əsası mətn qurmağın təlimi hesab olunur. Müstəqil mətn qurmaq vərdişinin bütün fənlər üçün xarakterik olması, ana dili ilə təbii, real inteqrasiyaya zəmin yaradır.

Ana dili kursu savad təlimi, hüsnxət, sinif oxusu, sinifdənxaric oxu, Azərbaycan dili, nitq inkişafı bölmələrindən ibarətdir. Bu bölmələr arasında sıx inteqrasiya mümkün ikən çox vaxt müəllim onları bir-birindən təcrid olunmuş sahələr kimi tədris edir.

Dil dərslərində şagirdlərin söz ehtiyatı ətraf aləmdəki cansız və canlı əşyaların, hadisələrin adları hesabına zənginləşir. Şagirdlər qrammatik qanunlara, qaydalara uyğun olaraq həmin sözlərdən istifadə etməklə cümlələr qurur, fikirlərini rabitəli şəkildə ifadə edirlər. Onların sonralar coğrafiya, kimya dərslərində müəllimin dediklərini anlamaları və öyrəndiklərini ifadə etmələri həmin söz ehtiyatının, həmin qrammatik konstruksiyaların köməyi ilə yerinə yetirilir. Deməli, həm ümumtəhsil məktəblərində, həm də ali məktəblərdə hər hansı fənnin digər fənlərlə əlaqəsi nəzərə alınmasa belə, onun ifadə vasitəsi olan Azərbaycan dili ilə birlikdə inteqrativ fəndir. Dil inteqrasiya vasitəsidir. Yeni tələblər baxımından bu gün, görünür, eksperiment yolu ilə güclü inteqrasiya aparmaq və ibtidai siniflərdə eksperimental tədqiqat məqsədilə ikicə dərsliklə kifayətlənmək mümkündür. Birinci dərslikdə xalqımızın folkloru, doğma yurdumuz haqqında bədii ədəbiyyat (oxu), xalqımızın dili (Azərbaycan dili), hüsnxət, doğma yurdumuzun təbiəti, onun gözəllikləri və təbii sərvəti (ətraf aləmlə tanışlıq və ya həyat bilgisi), yurdumuzla əlaqədar təsviri sənət və musiqi fənləri əhatə oluna bilər. Tematik prinsip əsasında qurulan belə dərslik üzrə deyək ki, bir neçə gün ərzində “Yurdumuzun

baharı” mövzusu keçilir. Bu dövrdə şagirdlər ilk bahar, onun əlamətləri haqqında elmi – kütləvi (idraki) mətn, bir neçə gözəl şeir oxuyur, bahar çağı tezçiçəkləyən ağaclar, bahar çiçəkləri, bulaqların, çeşmələrin qaynaması, bizim yerlərə gələn köçəri quşlar və s. ilə tanış olurlar. Onlar bahar çiçəklərinin, quşların, təbiətin gözəl bir guşəsinin şəklini çəkirlər, ilk bahara dair mahnı dinləyir, yeni mahnı öyrənirlər. Mövzu ətrafında lüğət toplayır, bu dövr üçün xarakterik olan sözləri dəftərlərində yazırlar. Onların hansı nitq hissəsi olması, hansı suallara cavab verməsi üzərində iş gedir...

İkinci dərslikdə riyaziyyat, əmək təlimi, fiziki mədəniyyəti, informatikanı birləşdirmək mümkündür. Əmək təlimində ölçmə, hesablama, həndəsi fiqurlardan istifadəyə ehtiyacın olması, fiziki mədəniyyətdə qaçma, hündürlüyünə, uzununa tullanma, yarışlarda iştirak edərək ölçmə, vaxtı hesablama məsələlərinin riyaziyyatla sıx bağlı olması məntiqi cəhətdən belə bir inteqrativ dərsliyin yaranmasına əsas verir.

İnteqrasiyanın vacibliyindən, onu təmin etməyin imkan və yollarından ötəri də olsa, danışarkən nəzərə almaq lazımdır ki, inteqrasiyanı tam təmin edən dərslik yaratmaq çətindir. Bugünkü şəraitdə bu cür çətinliklə qarşılaşmamaq üçün aşağıdakılara xüsusi diqqət yetirilməlidir:

1. İnteqrativ təlimin həyata keçirilməsi üçün proqramlar (kurikulum) əsaslı şəkildə yenişləməli, proqramlarda (kurikulumda) inteqrativ məzmun təqdim edilməlidir.

2. İnteqrasiyanın müntəzəm ardıcıl tətbiqinə nail olmaq üçün inteqrativ dərsliklər yaradılmalıdır.

3. İnteqrativ təlimin müvəffəqiyyətlə təşkili üçün inteqrativ təfəkkürə malik olan və inteqrativ fənni tədris etməyi bacaran müəllim kadrları hazırlanmalıdır.

4. Şagirdlərin əksəriyyətinin inteqrativ kursları bəzən sadəcə seyrçi kimi dinləyəcəkləri qorxusu qarşıya çıxır. Onlar hər şeydən xəbəri olan, lakin hər şeyi mükəmməl bilməyən kimi yetişə bilərlər.

İnteqrasiya ilə diferensiasiya arasında münasibət necə qiymətləndirilməlidir?

Elm yarandığı vaxtdan inteqrativ xarakter daşımışdır. Arximed, Aristotel və qədim dünyanın başqa filosofları bir neçə elm sahəsini mükəmməl bilmələri ilə interaktiv təfəkkürə malik olduqlarını sübut etmişlər.

Qədim dünyada təhsilin bünövrəsi qoyulduğu dövrdə inteqrasiyaya daha böyük ehtiyac varmış. Sonralar elm inkişaf etdikcə onun yeni sahələri meydana çıxmış diferensiallaşma getmişdir. Deməli, inteqrasiya və diferensiasiya bir oxun iki başıdır. Biri elmlərin əsasları ilə əlaqədar biliklərin üzvi əlaqədə, vəhdətdə verilməsini nəzərdə tutursa, digəri elmlərin əsasının diferensiasiya olunaraq, aralarında sərhəd qoyulmaqla ayrılıqda öyrədilməsi ilə əlaqədardır. Bunları bir – birindən ayrı təsəvvür etmək olmaz.

Məhz bu səbəbdən inteqrativ təlimə üstünlük verilən ölkələrdə də yuxarı siniflərdə təhsil sahələri üzrə təlimin diferensiallaşması nəzərdə tutulur. Bu gün fəaliyyətdə olan bazis tədris planında seçmə fənlərə xüsusi saatlar ayrılması IX sinifdən təhsil sahələri üzrə diferensiasiya aparılması buna bariz misaldır. Təlim prosesində belə diferensiasiya getməsə, sonralar elmdə diferensiasiya aparmaq, ayrı-ayrı sahələr üzrə dərinə getmək mümkün olmaz. Bu, bir həqiqətdir ki, həyat yolunun başlanğıcında inkişaf şansının bərabərliyi vacibdir. Təsadüfi deyil ki, I sinifdə təlim prosesində uşaqların sərbəstliyinə, müstəqilliyinə, demokratiya və humanizmə nə qədər üstünlük verilsə də, inteqrativ priyomlardan nə qədər istifadə olunsa da, ilkin oxu texnikası və kalliqrafik vərdişlər hamıya eyni həcmdə və qayda ilə aşılanır. Bir çox siniflərdə şagirdlər eyni cür oxuyur, kalliqrafik cəhətdən fərqlənməyən eyni xətlə yazırlar. Sonrakı siniflərdə hər

kəsin öz dəsti–xətti formalaşır. Təlimin məzmunu, metodları, həmçinin materialın mənimsənilmə sürəti baxımından diferensiasiya lazımdır. XXI əsrin əlaməti və tələbi təlimdə diferensiasiya və təhsillənmə yönümünü seçmək imkanının verilməsi, şagirdlərin və müəllimlərin təşkilati–kommunikativ forma və metodlarının bu yönümdə dəyişməsidir. Bu gün diferensiasiyanın hansı yolla getməli olması məsələsi də öz həllini gözləyir. Diferensiasiya edilmiş təlimin nə proqramı, nə dərsliyi, nə metodik vəsaiti, nə də materialı var. Bu gün məktəb variativ təlim, orijinal pedaqoji texnologiyaların yaranması, təcrübədə tətbiqi və sınaqdan çıxarılması üçün kifayət qədər texniki təchizata malik deyil. Diferensiasiyaya əməl olunması müəllimin ixtiyarına buraxılmışdır.

Son illərin təcrübəsi göstərir ki, bir çox yeni metod və priyjmların tətbiqi ilə əlaqədar terminlər, söz və ifadələrin mahiyyətinə, mənasına varmadan onları nitqdə yerli–yersiz işlədirlər. Bu gün xarici ölkələrdəki təhsil sistemi təcrübəsinin elementlərini ölkəmizə doğma Azərbaycan dilində də gətirə bilərik. Sivil ölkələrin təhsil sistemini diqqətlə öyrənib, ən dəyərli məsələləri milli təhsil sistemimizə gətirmək qanuni haldır. Bunsuz məktəbimiz, cəmiyyətimiz inkişaf edə bilməz. Bu istiqamətdə məqsədimiz Avropa, dünya təhsil sisteminə inteqrasiya olunmaqdır. Biz bu istiqamətdə elmi axtarışları düşünülmüş şəkildə davam etdirməliyik.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Kərimov Y. Ana dili tədrisi metodikasının nəzəri problemləri. Bakı, 2002.

2. Kərimov Y. İbtidai siniflərdə inteqrasiya. Bakı, 1998.

3. Veysova Y. Fəal/ interaktiv təlim. Bakı, 2007.

**Э.Каримова**

**Интеграция в начальной школе**

**Резюме**

Процесс интеграции следует рассматривать с точки зрения общей методологии социального познания. Идея интеграции требует нового подхода к отбору содержания знаний: интеграция дисциплин-это значительная экономия времени.

Интеграция в образовании формирует новое поле науки. Интеграция служит основой новой концепции, которая изменяет социально – экономические условия и развивает систему образования.

**E.Karimova**

**Integration is important in all classes**

**Summary**

The integration process should be considered in terms of the general methodology of social cognition. The idea of integration requires a new approach to the selection of content of knowledge: integration of disciplines is a significant time-saver.

Integration in education forms a new science field. Integration serves as the basis of a new concept that changes socio - economic conditions and develops education system.

# TƏDRİS PROSESİNDƏ DİYARŞÜNASLIQ VƏ ONUN ÖYRƏNİLMƏSİNƏ MÜƏLLİMLƏRİN YARADICI MÜNASİBƏTİ

**Şəfayət Rüstəmli**
***Yevlax şəhəri 4 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *müəllim, dərs, təlim metodikası, diyarşünaslıq, doğma diyar, tipik plan.*
***Ключевые слова:*** *учитель, урок, учебная методика, краеведение, родной край, типичный план.*
***Key words:*** *teacher, lesson, teaching methods, country study, motherland, typical plan.*

Müasir dövrdə ümumtəhsil məktəbinin başlıca vəzifəsi yüksək intellektual hazırlığa malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran, dünyagörüşü hərtərəfli inkişaf etmiş, milli və ümumbəşəri mənəvi keyfiyyətlərə yiyələnmiş şəxsiyyətin, əsl vətəndaşın yetişdirilməsindən ibarətdir. Respublikamızın təhsil sistemində daha səmərəli metodların tətbiq edilməsi də bu məqsədə xidmət edir. Keyfiyyəti yüksəltmək və təhsilin dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilməsi də buna xidmət edir. Odur ki, müəllimlər yeni axtarışlara qoşulmalı, işini müasir dərsə qoyulan tələblər səviyyəsində qurmağa çalışmalıdırlar. Çünki müasir dövrdə gənc nəslin elmi dünyagörüşü onun hərtərəfli hazırlığı, məntiqi gücü ilə bərabər emosional təsir gücü ilə də səciyyələnir. Gənc nəslin həyata, cəmiyyətə, informasiyaların qavranılmasına yanaşma tərzi yeni çalarlar kəsb edir. Nəzərə almaq lazımdır ki, elmi-texniki inkişafın, qloballaşma prosesinin sürətləndiyi bir vaxtda köhnə metodlarla işləmək yolverilməzdir. Deməli, müəllimin özünün yeni yanaşmalarla və ideyalarla işləməyə hazır olması zamanın tələbidir. Əgər müəllim həm öyrətmək, həm də öyrənmək səriştəliliyinə malik olarsa, qarşıya qoyulan məqsədə çatmaq da asan olar. Pedaqoji ədəbiyyatlardan da məlum olduğu kimi, müəllim təqlid və ya nümunə modelidir, gənc nəslin öz gələcəyinə baxdığı pəncərədir. Bu səbəbdən şagirdlər müəllimin yeniliyə, öyrənməyə və öyrətməyə nə dərəcədə həvəsli olduğunu görür, öz fəaliyyətlərini buna uyğun qurmağa səy göstərirlər. Bu uğura nail olmaq üçün coğrafiya müəllimləri daha geniş imkanlara malikdir. Bu imkanlardan biri kimi diyarşünaslıq materiallarından tədris prosesində səmərəli istifadəni göstərmək olar.

Hazırda respublikamızda elə bir məktəb yoxdur ki, orada doğma diyarın öyrənilməsi ayrı-ayrı müəllimlərin təlim-tərbiyə işində bu və ya digər şəkildə əks olunmasın. Lakin reallıq onu göstərir ki, yaşadığı ərazini necə, nə cür öyrənmək baxımından metodik material olmadığı üçün tədris məsələsində böyük əhəmiyyəti olan bu işə bir çox məktəb və müəllimlər yaxından qoşulmamışlar. Məktəb diyarşünaslığı ilə məşğul olan müəllimlər bu işi ya təsadüfdən-təsadüfə aparır, ya da şagirdlərin fəal iştirakına, müstəqil və müntəzəm müşahidə və tədqiqat aparmalarına, aparılan müşahidə və tədqiqat işlərinin

yekunlaşdırılıb yazılı şəklə salınmasına, işin ardıcıllığına, toplanan materiallardan öz dərslərində lazımi qədər istifadə olunmasına, həmin materialların işlənib saxlanması və yerli (və ya respublika) mətbuatda dərc olunmasına az fikir verirlər. Buradan belə qənaətə gəlmək olur ki, coğrafiya fənninin tədrisi ümumi məktəb coğrafiyası strukturunda diyarşünaslıq şəbəkəsinin inkişafına və onunla bağlı əlavə dərs vəsaitlərinin yaradılması zərurətini meydana atır. Belə vəsaitlər ölkənin ayrı-ayrı hissələrinin daha dərindən öyrənilməsinə, coğrafiya dərsliklərində verilmiş sual və tapşırıqların cavablandırılmasına şərait yaradır. O cümlədən diyarşünaslıqda topoqrafik-xəritə və planlar rayonların xarakteristikasına əlavə edilməklə, öyrənilən ərazinin təbiəti və təsərrüfatı haqqında ətraflı məlumatlar almağa imkan yaradır.

Diyarşünaslıq coğrafiyanın tədrisini həyata yaxınlaşdırmaq vəzifəsini qarşıya qoyur ki, bu da regionlarda sosial-iqtisadi inkişafın daha yaxşı həyata keçirilməsinin, yerlərdə təcrübəli ixtisaslı kadr hazırlığının əhəmiyyətini artırır. Ümumi coğrafi biliklərdən bəhrələnən diyarşünaslıq metodiki cəhətdən məhəl-ölkə-dünya anlayışlarını özündə birləşdirir, hər bir şagirdin təhsil səviyyəsini və dünyagörüşünü artırır. Həmçinin bunu nəzərə almaq lazımdır ki, coğrafiya və diyarşünaslığın birləşməsi daha mükəmməl dərsliklərin nəşr edilməsinə rəhbər olur. Kurikulum təhsil sistemi şagirdləri daha məntiqli və müstəqil düşünmə tərzinə səsləyir. Odur ki, digər fənlərdə olduğu kimi məktəb coğrafiyasının da daha maraqlı və düşündürücü olması zəruri məsələlərdəndir. Təlim metodikasında coğrafiyanın inkişafı üçün mövcud reallıqlardan biri kimi məhz diyar coğrafiyasının öyrənilməsi və işlənib hazırlanması elmi baxımdan günün mühüm tələblərindən birinə çevrilmişdir. Bu gün orta məktəb coğrafiya dərslikləri nə qədər bəşəri olub, Yer kürəsini təşkil edən sferalardan, materiklərdən, dünya ölkələrindən geniş bəhs etsə də, xəlqiliyə, vətənpərvərliyə həmişə ehtiyac olub, olacaqdır da.

Sirr deyil ki, məktəb coğrafiyasında Azərbaycan Respublikası coğrafiyasının yeri və rolu həmişə məxsusi olub. Səbəb: məktəb qarşısında duran təhsil-tərbiyə vəzifələrinin həllində Azərbaycan Respublikası coğrafiyasının rolunun yüksəldilməsinə vətənpərvərlik hissindən irəli gələn təbii bir sevgi kimi baxılması və vətəndaşlıq məsuliyyətinin olmasıdır. Lakin Azərbaycan coğrafiyasının ümumi şəkildə öyrənilməsi ilə yanaşı regional coğrafiyanın - yəni inzibati baxımdan 66 rayonun hər birinin ayrılıqda coğrafiyasının öyrənilməsinə də böyük ehtiyac vardır. Bu baxımdan 8-ci sinif Azərbaycan Respublikası coğrafiyası dərsliyinin bir bölməsinin bölgələrin coğrafiyasına həsr olunması və yaxud antalogiya şəklində işlənməsi əhəmiyyətli məsələlərdəndir.

Orta məktəb müəllimlərinin diyarşünaslıq sahəsinə elmi-yaradıcı münasibət bəsləməsi üçün Coğrafiya-Diyarşünaslıq mərkəzləri yaradılmalıdır. Belə fəaliyyət nəticə etibarilə 8-ci sinif Azərbaycan Respublikası coğrafiyası dərsliyi üçün əlavə material zənginliyi yaradar. Elə bu baxımdan Coğrafiyanın “kiçik modeli” adlandırılan diyarşünaslığı əslində “böyük modelə” çevirmək olar. Bu mənada tədris aləmində bölgələrin coğrafiyası silsiləsindən Yevlax rayonunun coğrafiyasının işlənməsi diyarşünaslıq materialları içərisində ən geniş məlumat toplusuna və elmi-tədqiqat xarakterinə malik olan coğrafi ədəbiyyatlardan biridir. Bir müəllif kimi dörd illik əməyin nəticəsi olaraq yaşadığım rayonun təbiəti, təbiətlə bağlı ayrı-ayrı komponentlərin xüsusiyyəti, iqtisadi-coğrafi səciyyəsi və perspektivlərinə dair məlumatların verilməsi təkcə Yevlax məktəbliləri və yerli sakinlər üçün deyil, digər oxucular üçün də əhəmiyyətli olduğunu düşünürəm. Rayonun coğrafiyası metodiki baxımdan

məntiqi ardıcıllığa uyğun plan üzrə hazırlanmışdır. Eksperimental olaraq Yevlax məktəbliləri coğrafiya dərsliklərində yaşadıqları əraziyə aid verilən sual və tapşırıqları cavablandırarkən "Yevlaxın coğrafiyası" adlı vəsaitdən istifadə edir və əlavə bilik əldə edirlər. Arzu edirəm bu formada digər bölgələrimizin də coğrafiyası işlənsin və şagirdlərə doğma diyar anlayışı təfərrüatı ilə çatdırılsın. Bölgələrimizin coğrafiyasından bəhs edən belə materiallar vikimaterial kimi də informasiya aləmində əhəmiyyətli yer tutar.

Doğma diyarı öyrənmək və təsvir etmək olduqca ciddi bir işdir. İlbəil bu işi davamlı şəkildə yoxlamaq, dərinləşdirmək tələb olunur. Ona görə də müəllimlər işə yaradıcı münasibət bəsləməklə naturalist olmalıdırlar. Yalnız naturalist müəllimlər müşahidə və tədqiqat vasitəsilə təbiəti öyrənir, eksperimentdən keçirir və onun haqqında daha çox bilik toplamağa çalışır. Bu biliklər insanın ehtiyacını ödəmək üçün təbiətdən daha səmərəli və daha yaxşı istifadə etmək işində böyük əhəmiyyətə malikdir.

Məktəb diyarşünaslığı sahəsində müəllimlərin elmi-tədqiqat işi ilə məşğul olması çox şərəfli bir işdir. Müəllim belə bir şərəfli işin öhdəsindən layiqincə gələrsə həm öz ixtisasını artırmış, həm də tədris işində mühüm yer tutan bu məsələyə daha artıq ciddiyyət və həvəslə yanaşmış olar.

Təcrübə göstərir ki, məktəb diyarşünaslığı şagirdlərin siyasi-məfkurə tərbiyəsi, təhsildə formalizmi aradan qaldırmaq və məktəbliləri yaxın gələcəkdə hər hansı bir fəaliyyətə hazırlamaq üçün ən zəruri vasitələrdən biridir. Məlumdur ki, yurd sevgisi uşaqlarda evdən-ailədən başlayır. Elə ona görə də məktəb öz şagirdlərini ətrafdakı təbiətə və əhalinin təsərrüfat fəaliyyətinə düzgün və diqqətli fikir verməyə alışdırmaqla, onların doğma yerdən uzaqlarda baş verən hadisə və həqiqətləri də mənimsəyib öyrənmələrinə yardım edir. Şagirdlər öz yaşayış yerlərini mükəmməl öyrəndikdən sonra, vətənimizin digər yerlərini canlı seyr etməyə can atmaları şübhəsizdir.

Coğrafiya müəllimləri yurd sevgisini artırmaq üçün fənn kabinələrində doğma diyara aid diyarşünaslıq guşə və sərgiləri yaratmaqla şagirdləri birbaşa bu işə cəlb edə bilərlər. "Bizim rayon", "Bizim şəhər", "Bizim kənd" adlı diyarşünaslıq guşələrində əsasən aşağıdakı işlər görülməlidir:

1. Yerli bitki nümunələrini yetişdirmək və ya herbarilər düzəltmək;
2. Yerli heyvanat aləminə aid müqəvva və ya kolleksiyalar hazırlamaq;
3. Mineral süxurlara aid nümunələr toplamaq;
4. Torpağın təsnifatı üzrə nümunələr toplamaq;
5. Yerli mədəni bitkilərdən (buğda, pambıq, tütün, çay kolu və s.) nümunələr toplamaq;
6. Doğma diyara aid xəritə və planların təsvirlərini əldə etmək;
7. Yerli qəzet, məcmuə və digər ədəbiyyat nümunələri toplamaq;
8. Doğma diyarın məşhur və tanınmış adamları haqqında materiallar toplamaq;
9. İKT materialları kimi foto-bukletlər, slaydlar, canlı görüntülər hazırlamaq və s.

✓ Diyarşünaslıq – müəllimin ən yaxınında olan əyani vəsait nümunəsidir.

✓ Diyarşünaslıq- coğrafiyanın metodikasında ümumiyə istinad edərək, tədris fənninin məzmununun spesifikliyindən irəli gələn xüsusini işləyib hazırlayır.

✓ Diyarşünaslıq–böyük coğrafiyanın kiçik "modelidir".

✓ Təbiət elmlərini coğrafiyasız, coğrafiyanı diyarşünaslıqsız təsəvvür etmək olmaz.

Orta məktəb müəllimlərinə kömək məqsədilə öyrənilən ərazinin tipik planını aşağıdakı kimi təqdim edirik:

1. Öyrənilən ərazinin xəritə üzrə coğrafi mövqeyini, sahəsi və sərhədlərini müəyyən etmək.

2. Yer qabığını təşkil edən süxurlar, onların yerləşmə xüsusiyyəti. İstehsala cəlb olunan faydalı qazıntıları.

3. Relyefi, relyefə təsir edən amillər. Relyefin təsərrüfat əhəmiyyəti.

4. İqlimi. İl ərzində baş verən mühüm dəyişikliklər.

5. Daxili suları.

6. Torpaq örtüyü, onun məhsuldarlığı.

7. Bitki və heyvanat aləmi.

8. Təbiəti mühafizə məsələləri.

9. Yerli toponimlər.

10. Tarixi-coğrafi səciyyəsi.

11. Təsərrüfatı (sənayesi, kənd təsərrüfatı, nəqliyyatı və s.).

12. Əlavə məlumatlar.

Təqdim olunan bu plan bir qədər şərti xarakter daşıyır. Odur ki, yanaşma tərzinə görə bu işdə iştirak edəcək tədqiqatçılar müstəqil ola bilərlər.

Bəllidir ki, orta məktəbdə coğrafiyanın ibtidai kursu 6-cı sinifdən başlayır. Yer təbiəti və cəmiyyətlə bağlı ümumi anlayışlar məhz bu kursda öyrədilir. Dərslikdə təlim materialları "Coğrafiya: dünən və bu gün", "Cəmiyyət", "Yerin bərk təbəqəsi", "Şəffaf kürə", "Yerin su təbəqəsi", "Təbiət və insan", "Yer-Günəş sistemində", "Yer səthinin təsviri" adlı tədris vahidləri üzrə qruplaşdırılmışdır. Sonuncu tədris vahidində şagirdlərin cəhəti təyin etmək bacarığı, azimutların kompasla təyin edilməsi, məsafələrin ölçülməsi, miqyasın qurulması, relyef üzərində horizontların təyini, məhəllin sxematik planının tərtib edilməsi və s. əsasdır. Bu işlərin həyata keçirilməsi elmi – nəzəri biliklərlə yanaşı praktika tələb edir. Əsasən məktəbə yaxın olan ərazilərdə aparılan belə praktikalar həm şagirdlərdə ətraf mühiti müşahidə qabiliyyətinin inkişafına, həm də yaşadıqları ərazi ilə bağlı coğrafi elmi biliklərin artmasına səbəb olur.

Mahiyyət etibarilə 6-cı sinif coğrafiya kursu bütövlükdə diyarşünaslıq əsasında tədris olunur. "Litosfer", "Atmosfer", "Hidrosfer", "Biosfer" kimi mövzularda məktəbə ən yaxın məhəldə şagirdlərin bilavasitə müşahidə və praktik işlərinə geniş istinad edən materiallar öyrənilir.

Metodik quruluşuna görə dərslər iki tipli ola bilər: 1. Praktik məşğələ tipli 2. Tədris tipli.

Birinci tip dərslər adətən çöl şəraitində həyata keçirilir. Bu topoqrafik, hidrometrik, geomorfoloji və s. işlərin yerinə yetirilməsi ilə əlaqədər şagirdlərin praktik məşğələlərə cəlb edilməsidir. İkinci tip dərslər sinif şəraitində gündəlik tədris edilən dərslərdir. Burada müəllim mövzuya uyğun diyarşünaslıq materiallarından həm söhbət əsnasında, həm də əyani vəsaitlər üzrə istifadə edir. 7-ci sinif materiklər coğrafiyası kursunda da konkret diyarşünaslıq materiallarından istifadə olunur. Materiklərin iqlimini, çaylarını, təbii zonalarını öyrənərkən, bu təbii komponentlər doğma diyarın yerli şəraiti ilə müqayisə olunur. Məsələn, dərsdə öyrənilən rayonların iqlimi ilə bağlı konkret məlumatları doğma məhəllin məlumatları ilə müqayisə etməklə, şagirdlərdə bu rayonların iqlimi haqqında yalnız şifahi izahata nisbətən daha real təsəvvür yaratmaq olar. Bu, təkcə iqlim sahəsində deyil, relyef, daxili sular, təbii zonalar və s. mövzularda müqayisəli təhlil formasında tədris oluna bilər.

8-ci sinif Azərbaycan Respublikasının coğrafiyası kursunun öyrənilməsi ilə eyni zamanda doğma diyarın daha təfərrüatı ilə öyrənilməsi işi aparılır və əvvəlki siniflərə nisbətən tədrisin diyarşünaslıqla daha möhkəm, dərin əlaqəsi yaradılır. Tədris məşğələləri ərzində məktəblilərə diyarşünaslıq müşahidələri və onların işlənməsinə dair

tapşırıqlar verilir. Tapşırıqların xarakteri proqram ilə təyin edilir. Burada demək olar ki, hər bir mövzu doğma diyara dair hər hansı bir praktiki işlə müşayiət edilir. Odur ki, diyarşünaslıq prinsipi Azərbaycan Respublikasının coğrafiyası kurslarında geniş tətbiq olunur. Şagirdlər Azərbaycan Respublikasının coğrafi mövqeyi və sərhədləri ilə tanış olarkən, doğma diyarın da coğrafi mövqeyi izah edilir və ona qiymət verilir.

Azərbaycanın “Relyefi” mövzusunda şagirdlər tərkibinə doğma diyarın da daxil olduğu ərazinin geomorfoloji baxımdan relyefin yerli formalarının genetik əlaqələrini müəyyən edir və müqayisəli yerli relyef formalarının təsvirindən istifadə edirlər.

“Azərbaycan Respublikasının iqlimi” – bu mövzu ilə əlaqədar məktəbin yerləşdiyi rayonda aparılan meteoroloji müşahidələrdən yerli hava kütlələrinin fəaliyyətini, fəsilləri üzrə hava şəraitinin iqlimlə əlaqələrini izah etmək üçün istifadə olunur.

“Azərbaycan Respublikasının daxili suları” mövzusunda yerli çayların qidalanma mənbələri, rejimi və təsərrüfatda bu çaylardan istifadə edilməsi haqqında məlumatlar Azərbaycanın digər çaylarına dair oxşar məlumatlarla tutuşdurulur.

“Torpaq – bitki örtüyü və heyvanlar aləmi” mövzusunu öyrənərkən, doğma diyarın torpaq – bitki örtüyü və heyvanlar aləmini və eləcə də landşaft tipini əhatə edən bütün materialdan istifadə edilir.

“Azərbaycan Respublikasının təbii vilayətləri” mövzusu doğma diyarın yerləşdiyi təbii vilayət və eləcə də fiziki – coğrafi rayon üzrə təbiətinin öyrənilməsinə dair görülən diyarşünaslıq işinə yekun vurulmalı, digər rayonlarının təbiəti arasındakı oxşar və fərqli xüsusiyyətlər müəyyən edilməlidir.

“Azərbaycan Respublikasının iqtisadi və sosial coğrafiyası” kursunun tədrisində diyarşünaslıq prinsipi şagirdlərin təsərrüfatın strukturu və doğma diyarın ən mühüm təsərrüfat sahələri ilə tanışlığını nəzərdə tutur. Doğma diyarın daxil olduğu iqtisadi rayon öyrənilərkən, rayon təsərrüfatında onun yeri və əhəmiyyəti aşkara çıxarılır. Yerli təsərrüfatın öyrənilməsi və material toplanması müxtəlif yollarla aparıla bilər. Məsələn, fərdi və qruplara verilən tapşırıqlar istehsalat sahələrinə edilən ekskursiyalar zamanı, icra hakimiyyəti orqanlarında, Bələdiyyə komitələrində, yerli mətbuatda və s. öz həllini tapa bilər. Kənd məktəblərində kənd təsərrüfatı işləri ilə əlaqədar praktika çox şey verə bilər. Məktəblilər bu işdə iştirak etməklə yerli kənd təsərrüfatı sahələri ilə tanış olurlar. Müəllim xüsusi tapşırıqların köməyi ilə bu tanışlığı şagirdlərə daha dərin və ətraflı mənimsətmiş olur.



9-cu sinif "Dünyanın iqtisadi və sosial coğrafiyası" kursunun məzmunu ilə diyarşünaslığın əlaqəsi digər məktəb kurslarına nisbətən az dərəcədə müəyyən olunur. Burada diyarşünaslıq materialından daha çox ölkəşünaslıq xarakterinin tətbiqi daha məqsədəuyğundur. Azərbaycan Respublikasının xarici ölkələrlə müqayisəli səciyyəsi üçün bu məsələnin faktik cəhətini işıqlandıran və eyni zamanda öyrənilən ölkələrin təsvirini canlandıran çoxlu məlumatları almaq olar. Nəticə etibarilə demək lazımdır ki, coğrafiyanın bütün kurslarında diyarşünaslıq ölkəşünaslıq prinsipinin tədrisi məktəblərdə müəllimlərin yaradıcı səviyyəsindən çox asılıdır.

10-cu sinif "Yerşünaslıq" yerin coğrafi təbəqələrini əhatə edir. Burada da diyarşünaslıq materialları ilə uzlaşan bir çox mövzular vardır.

"Türk dünyasının coğrafiyası" orta məktəb coğrafiyasında sonuncu pillədə-11-ci sinif üzrə tədris olunur. Bu kurs təkcə diyar anlayışı ilə deyil, ölkəşünaslıq və türkşünaslıq əhatəsinə qədər genişlənir. Burada özünütanıma, özünüdərk məsələsi aktuallığı ilə seçilir. Bu coğrafi kursun məqsədi şagirdləri təkcə müxtəlif status və inkişaf xüsusiyyətləri ilə fərqlənən türk dövlətləri və qurumlarının təbii şəraiti, ehtiyatları, əhalisi, iqtisadi – sosial coğrafiyası ilə tanış etmək deyil, türk xalqlarının böyük və qədim olduğunu nəzərə çatdırmaqdan ibarətdir. "Türk dünyasının coğrafiyası" diyarşünaslıq anlayışının zirvəsidir. Burada ən böyük diyarşünaslıq anlamı məkan anlayışı ilə yanaşı türk olduğunun isbat edilməsidir. Digər tərəfdən bu kursun tədrisində məna və məzmun vəhdəti vardır. Məzmununda əsas məqsəd Türk dünyası ölkələrinin coğrafiyasını öyrənməkdirsə, mənası isə onun mənəvi tərəfinə yönəlməsidir. Başqa sözlə, şagirdlərin yaşadığı yer məkanını müəyyən edirsə, mənəvi anlamda isə özünüdərk və soykökünə baxışı müəyyən etməsidir. Diyarşünaslıq "Türk dünyasının coğrafiyası"nda tamamlanır. Bu tamamlanma hərtərəfli olmaqla bütövlüyə gedən bir yolun zirvəsidir.

Orta məktəb coğrafiyasında tədris olunan ayrı–ayrı mövzuların Diyarşünaslıq materialları ilə əlaqələndirilməsi üçün sual və tapşırıqların tərtibi.

8-ci sinif Azərbaycan Respublikasının fiziki coğrafiyası proqramı üzrə:

Mövzu: Azərbaycan Respublikasının coğrafi mövqeyi, sahəsi və sərhədləri

1. Dünyanın siyasi xəritəsində Azərbaycan Respublikasının coğrafi mövqeyini, sərhədlərini müəyyən edin.

2. Yaşadığınız ərazinin coğrafi mövqeyini Azərbaycan Respublikasına görə təyin edin.

3. Azərbaycan Respublikasının sahəsi nə qədərdir? Bundan nə qədəri işğal altındadır? Bəs yaşadığın rayonun (şəhərin və ya kəndin) sahəsi nə qədərdir?

4. Azərbaycan quruda hansı ölkələrlə həmsərhəddir?

5. Azərbaycan Respublikasının İnzibati - ərazi bölgüsü xəritəsinə əsasən yaşadığınız yer hansı rayonlarla qonşuluq mövqeyinə malikdir? Xəritənin miqyasına əsasən onların uzunluqlarını təyin edin.

Mövzu: Azərbaycan Respublikasının relyefi

1. Azərbaycan ərazisində hansı relyef formaları var? Relyefin digər komponentlərlə nə kimi əlaqəsi var?

2. Yaşadığınız ərazidə hansı dağlar, düzənliklər yayılıb? Ərazidə hansı ekzogen mənşəli relyef formalarına rast gəlinir?

3. Relyefin təsərrüfat əhəmiyyətini səciyyələndirin.

Mövzu: Geoloji quruluş və faydalı qazıntılar.

1. Azərbaycan ərazisində yayılmış süxurların yaşını və tipini müəyyən edin.

2. Yaşadığınız ərazidə hansı növ sü-

xurlar yayılıb? Era və dövrlərə görə yaşını müəyyən edin.

3. Yaşadığınız ərazi hansı tektonik zonada yerləşir?

4. Yaşadığınız ərazidə hansı tektonik hadisələr baş verir?

5. Yaşadığınız ərazidə hansı növ faydalı qazıntılara rast gəlinir? Onlardan hansıları istismara cəlb olunub?

Mövzu: İqlim və onun xüsusiyyətləri

1.Yaşadığınız ərazinin fəsillər üzrə iqlimini səciyyələndirin (Fenoloji təhlil)

2. Yaşadığınız ərazinin iqliminə hansı hava kütlələri təsir edir?

3. Rayonunuzun iqlimini təsərrüfat baxımdan qiymətləndirin.

4. Rayonunuzda iqlimlə bağlı hansı təbiət hadisələri səciyyəvidir?

5. Planetar iqlim dəyişkənliyi yaşadığınız yerə necə təsir edir?

Mövzu: Daxili sular

1. Azərbaycanın fiziki xəritəsinə əsasən hidroqrafik şəbəkəni xarakterizə edin.

2. Sizin yaşadığınız ərazidən hansı çaylar axır? Bu çaylar əsasən nə ilə qidalanırlar?

3. Yaşadığınız ərazidə hansı göllər var?

4. Yaşadığınız ərazidə yeraltı sular, bataqlıq suları, buzlaqlar varmı?

5. Ərazinizdə mövcud olan su obyektlərini təsərrüfat baxımdan qiymətləndirin.

6. “Su həyatdır”– ifadəsini təhlil et.

Mövzu: Torpaq örtüyü

1. Azərbaycanın torpaq xəritəsinə əsasən torpaq tiplərini müəyyən edin.

2. Sizin yaşadığınız ərazidə hansı torpaq tipləri yayılmışdır?

3. Torpaq tiplərini təsərrüfat baxımdan qiymətləndirin.

Mövzu: Bitki örtüyü

1. Azərbaycan ərazisində bitki örtüyünü landşaftlar üzrə müəyyən edin.

2. Respublikamızda bitki örtüyünün müxtəlifliyini izah edin.

3. Yaşadığınız ərazidə üstünlük təşkil edən bitki qruplarını müəyyən edin. Bunların içərisində endemik bitkilər varmı?

4. Ərazinizdə müalicəvi əhəmiyyətə malik hansı bitki növlərini tanıyırsınız?

5. Yaşıllaşdırma işində iştirak edirsinizmi?

Mövzu: Heyvanlar aləmi

1. Respublikamızın təbiətinə uyğun olaraq heyvanlar aləmini müəyyən edin.

2. Yaşadığınız ərazidə hansı heyvan növləri yayılmışdır?

3. Heyvanlar aləminin qorunmasına dair rayonunuzda hansı tədbirlər həyata keçirilir?

Mövzu: Təbiəti mühafizə

1. Rayonunuzda təbiəti mühafizə məsələləri ilə bağlı hansı tədbirlər həyata keçirilir?

2. Yaşadığınız ərazidə qoruq, yasaqlıq və milli parklar mövcuddurmu? Mövcuddursa onlar haqqında məlumat verin.

Azərbaycan Respublikasının iqtisadi və sosial coğrafiyası (8-ci sinif)

Mövzu: Azərbaycan Respublikasının iqtisadi – coğrafi mövqeyi

1. Azərbaycan Respublikasının İCM – ni xəritə üzrə əlverişli və qeyri-əlverişli xüsusiyyətlərini təhlil edin.

2. Azərbaycan Respublikasının İCM – nə görə yaşadığınız ərazinin müsbət və mənfi cəhətlərini təhlil edin.

Mövzu: Təbii şəraiti və ehtiyatları

1.Yaşadığınız rayonun təbii şəraitini və təbii ehtiyatlarını iqtisadi baxımdan qiymətləndirin.

2. Yaşadığınız ərazidə hansı təbii sərvətlərdən istifadə olunur?

3. Rayonunuzda gələcəkdə istifadəsi mümkün olan hansı növ sərvətlər var?

Mövzu: Azərbaycan Respublikasının əhalisi və onun milli tərkibi

1. Yaşadığınız rayonun əhalisinin sayı

nə qədərdir?

2. Orta sıxlığı təyin edin.

3. Əhalinin cins və yaş tərkibini, milli tərkibini, kənd və şəhər əhali nisbətini, urbanizasiya və miqrasiya, əmək ehtiyatları və digər bu kimi məsələləri rayonunuzun müvafiq strukturlarından öyrənməklə müəyyən edin.

Mövzu: Təsərrüfatın ümumi səciyyəsi

1.Yaşadığınız ərazinin təsərrüfat strukturu haqqında məlumat verin.

2. Maddi və qeyri – maddi istehsal sahələrinin nisbətini müəyyənləşdirin.

3. Yaşadığınız ərazi üzrə fəaliyyət göstərən dövlət və özəl təsərrüfat sahələrini müəyyən edin.

4. Yaşadığınız ərazidə respublika əhəmiyyətli müəssisələr varmı? Əgər varsa onların fəaliyyəti haqqında danışın.

Ayrı-ayrı rayon məktəblilərinin yuxarıdakı suallara cavab tapmaları üçün yerli coğrafi ədəbiyyatlar hazırlanmalıdır.

*Rəyçi: əməkdar müəllim A.Muradov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). // Azərbaycan məktəbi, 2011, № 6.

2. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Monoqrafiya. Bakı: Mütərcim, 2011.

3. Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.

4. Kərimov Y. Təlim metodları. Bakı: RS Poliqraf, 2010.

5. Bibik A. və b. “Orta məktəbdə coğrafiya təliminin metodikası”. K.F.Stroyev “Coğrafiyanın məktəb kursunda məhəlşünaslıq və məhəlşünaslıq prinsipi”. Bakı: Maarif, 1973, səh 423.

6. Eminli K. Biliklərin möhkəmləndirilməsində təlimi texniki vasitələrinin rolu. Bakı, 1997, səh 220.

7. Əliyarzadə R. İKT əsaslı innovativ tədris yanaşmaları // Kurikulum, 2011, № 1, səh. 69-73.

8. Xalıqov A. Öyrənməyi öyrətmək əsas vəzifədir. // Azərbaycan məktəbi, 2013, № 4.

**Ш.Рустамли**

**Творческое отношение учителей в изучении краеведения в учебном процессе**

**Резюме**

В статье говорится о применении краеведческого материала в учебном процессе и творческом отношении учителей к этому делу.

**Sh.Rustamly**

**Teachers` creative approach to teaching geography and country study**

**Summary**

In this article it is spoken about teachers` creative approach to teaching Geography and Country study at secondary schools.

***Tərbiyə məsələləri***

# BƏZİ MƏNƏVİ DƏYƏRLƏRİMİZ HAQQINDA

**Sədaqət Hüseynova**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *sadəlik, təvazökarlıq, gözəl keyfiyyətlər.*
***Ключевые слова:*** *простота, скромность, прекрасные качества.*
***Key words:*** *simplicity, modesty, good qualities.*

Əxlaqi keyfiyyətlərin aşılanması məktəbdə tərbiyə işinin əsasını təşkil edir. Şagirdlərin əxlaqi keyfiyyətlərə yiyələnməsi erkən yaşlardan başlanmalıdır. Çünki özündə lap uşaqlıqdan bu keyfiyyətləri tərbiyə edən adam sonrakı mərhələlərdə cəmiyyət üçün lazımlı fərdə, alicənab və ləyaqətli şəxsə çevrilir. Yüksək əxlaqa malik insan kimi yetişməkdə düzgün tərbiyə mühüm rol oynayır. Cəmiyyətin belə adamlara ehtiyacı həddindən çoxdur. Əxlaqi keyfiyyətlər insanların fəaliyyəti ilə sıx bağlıdır. Məlumdur ki, cəmiyyətdə, ayrı-ayrı kollektivlərdə yalnız yaxşı tərbiyə görmüş, yüksək əxlaqi keyfiyyətlərə sahib insanların olması işin effektli qurulmasına təkan verir. Belə adamların gördüyü bütün işlər dəyərli və xeyirxah məqsədli olur. Belə insanlar cəmiyyətə və ayrı-ayrı adamlara fayda verdikləri kimi, özləri də cəmiyyətdən daha səmərəli faydalanırlar. Bunlar qarşılıqlı anlaşma mühiti üçün zəmin hazırlayırlar.

Düzgün tərbiyələndirməyə dair şagirdlər dərsliklərdə, bədii ədəbiyyatda çoxlu nümunələrə rast gəlirlər. Məsələn, atalar sözlərində, nağıl və dastanlarda ən yüksək əxlaqi keyfiyyətlər daha qabarıq verilir. Müxtəlif xalqların bədii yaradıcılıqlarında da gözəl keyfiyyətlər böyük məhəbbətlə tərənnüm edilir. Kim təsdiq etmir ki, Homer, Nizami, Şekspir, Tolstoy, Puşkin, Taqor kimi sənətkarların əsərlərində insanın böyük və gözəl əxlaqi keyfiyyətləri dərhal diqqəti cəlb edir. Azərbaycan pedaqoqlarının da əsərlərində bu barədə gözəl fikirlər söylənmişdir.

XVIII əsr mütəfəkkirlərindən N.İ.Novikov demişdir ki, "Dövlətlərin tərəqqisi, xalqların rifahı mənəvi xeyirxahlıqdan, mənəvi xeyirxahlıq isə tərbiyədən asılıdır". Buna görə də, öz-özünü tərbiyə baxımından tərbiyəçilər kimi tərbiyə olunanların da üzərinə müəyyən məsuliyyətlər qoyulur. Deməli, insanın əxlaqi keyfiyyətləri həm ətraf mühitlə, həm tərbiyənin təsiri ilə, həm də onun iradi keyfiyyətləri ilə sıx bağlıdır. İnsanın əxlaqi keyfiyyətlərinə yalnız bunlar təsir etmir. İnsan həm də cəmiyyətdə başqa insanlar arasında yaşayarkən onların hərəsindən bir şey öyrənir: ya mənfi, ya müsbət.

Ata-babalarımız yüksək əxlaqi keyfiyyətlərdən söz salanda, ilk növbədə insanı təvazökar, sadə, doğruçu, dürüst, alicənab, mərifətli görmək istəmişlər. Klassiklərimiz kimi, xalq da özünün şifahi yaradıcılığında insanlardakı bu cəhətləri təqdir etmiş, ona hər yerdə müsbət yanaşmışlar. Hətta "Kitabi-Dədə Qorqud" dastanında göstərilir ki, oğuzlar olduqca təvazökar və sadə olmuşlar, onlar özlərindən kiçiklərə təkəbbürlə davranmamışlar. Hətta özlərini başqalarından üstün tutanlara dərinin üstündəki sızanaq kimi baxmışlar.

Azərbaycanın görkəmli şairi Xaqani Şirvani öz nəsihətlərinin birində yazmışdır:

"Mənəm, mənəm" deyib öymə özünü,
Həmişə müxtəsər söylə sözünü,

Cahildir özünü tərif edənlər,
"Çox bilirəm" demə bilsən də əgər.

Böyük şair özü də təvazökarlığı özünü başqalarından üstün tutmamaq kimi anlatmağa çalışmışdır. Xaqani onu da deyirdi ki, "Təvazökar olan daim yüksələr". Mütəfəkkir şairimiz Nizami də istəyirsənsə böyük adam olub ucalasan, təvazökar ol, kimi nəsihətlər verirdi. Azərbaycan klassiklərinin əsərlərində pedaqoji-psixoloji fikirlərin arxasında həmişə belə tərbiyəvi məqsəd dayanmışdır. A.Bakıxanova görə, sadəlik və təvazökarlıq xoşbəxtlik əldə etməyin ən mühüm vasitələrindən biridir. O yazırdı: "Dərya öz-özünə dalğalanır, çör-çöp isə elə bilir ki, bu dalğalanma ona görədir".

Klassiklərimiz insanın mərifətli olmasını, əsas onun əxlaqi keyfiyyətlərindən biri sayırdı.

Qədim el məsələlərindən birində deyilir: "Mərifət-gənclərin imtiyazıdır".

XX əsr Azərbaycan klassiklərindən, dünya romantik şeirinin müqtədir simalarından olan Məhəmməd Hadi elmin, mərifətin işıqlı gələcək uğrunda mübarizədə böyük rolunu daha dolğun və ciddi ifadə etmişdir:

Elmin, hünərin, mərifətin varsa, buyur gəl,
Yoxsa, bu həyat aləminə olma bir əngəl.

Təbiidir ki, ümumi etik normalarında iş yoldaşları ilə, tanışları ilə mərifətli rəftar etməyənlərin, ailədə dedi-qodu yaradanların əxlaqi keyfiyyətləri müsbət qəbul edilmir.

Klassiklərimiz də bu qaydadan kənara çıxanları, yəni ən azı öz-özünə lovğalananları kəskin tənqid etmişlər. Sadəlik və təvazökarlıq insanın ən zəngin var-dövləti kimi qiymətləndirilmişdir. Pedaqogikamız da elə hazırkı dövrdə müəllimlərimizin qarşısına belə vəzifələr qoymuşdur ki, tərbiyə prosesinin əsas ideya istiqaməti vətənə layiqli gənclər tərbiyə etməkdən, sadəlik, təvazökarlıq, nəzakətli olmaq kimi yüksək keyfiyyətlərə malik nəsil yetişdirməkdən ibarətdir. Çünki insan cəmiyyətdə yaşayır, cəmiyyət isə insan əxlaqına, onun mənəvi simasına, əxlaqa zidd hərəkətlərinə, hərəkət və tərbiyəsinə etinasız yanaşa bilməz.

Böyük Nizaminin aşağıdakı misraları fikrimizi tamamlamağa kömək edir:

Kimə nəsib səndəki səadət, bəxtiyarlıq?
Dünyanın əşrəfisən, dünya mülkü sənindir,

Göründüyü kimi, əxlaqi keyfiyyətlər nəinki tərbiyə prinsipi, o həm də bəşəri dəyərlərdir.

*Rəyçi: fəlsəfə doktoru Ş.Balakişiyev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Nizami Gəncəvi. Poemalar. Bakı, 1985.
2. Əliyev M. Təvazökarlıq insanın yaraşığıdır. Bakı, 1967.
3. Seyidzadə T. Gördüyüm işlər aldığım qiymət. Bakı, 2013.
4. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı, 1990.

**С.Гусейнова**

**О некоторых духовных ценностях**

**Резюме**

В статье рассматриваются проблемы нравственного воспитания школьников.

**S.Husseinova**

**About some moral virtues**

**Summary**

This article deals with the development of the students' moral qualities.

